Jurnal 25.04.2007-ci ildə Azərbaycan Respublikası Ədliyyə Nazirliyi Mətbu nəşrlərin reyestrinə daxil edilmişdir. Reyestr № 2212

---

The journal is included in the register of Press editions of the Ministry of Justice of the Republic of Azerbaijan on 25.04.2007. Registration No. 2212




Azərbaycan Mətbuat Şurası
MŞ
Azerbaijan Press Council

---

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti, 529,
"Azərbaycan" nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat avenue, 529,
"Azerbaijan" Publishing House,
6-th floor

**Tel.:** +994 50 209 59 68
+994 55 209 59 68
+994 99 809 67 68
+994 12 510 63 99

**e-mail**
elmmerkezi@aem.az

## Beynəlxalq indekslər / International indices

ISSN: 2663-4619
e-ISSN: 2708-986X
DOI: 10.36719
































































## Təbiət elmləri



## Dəqiq elmlər



## Texnika elmləri

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/87/8-16

**Firədun Nadir oğlu İbrahimov**
ADPU-nun Şəki filialı
pedaqoji elmlər doktoru
https://orcid org/0000-0002-0775-1048
firedun52@mail.ru
**Sevil Fərrux qızı İbrahimova**
ADPU-nun Şəki filialı
https://orcid.org/0000-0002-8944-3611
ibrahimova_57@mail.ru

# AZƏRBAYCAN ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ TEXNOLOGİYA FƏNN KURİKULUMUNUN "FƏNNİN MƏZMUNU BLOKU" ELEMENTLƏRİNİN "SİSTEM-STRUKTUR" YANAŞMA ƏSASINDA ŞƏRHİ

**Xülasə**

Məqalədə kurikulum islahatının Azərbaycanda təhsilin həyata keçirilməsinin XXI əsrin çağırışlarına adekvatlığını təmin etmək, yaradıcı, özünü inkişaf etdirən şəxsiyyət yetişdirmək tələbatı ilə şərtləndiyi vurğulanır, ümumi təhsilini başa vurmuş şagirdin subyektinə çevrilməsi zəruri olan qabiliyyətlərin mündəricəsi göstərilir.

Tədqiqat işində təhsilverənin həm təhsil proqramının mahiyyətinə bələd olmasında, həm də onun icrası ilə bağlı praktiki fəaliyyətində "sistem-struktur" yanaşmaya istinad etməsinin əhəmiyyətliliyi, fənyönümlü kurikulumların məzmun etibarı ilə aidiyəti elm sahəsini, onun mükəmməl anlayışlar sistemini əhatə etməklə, bilavasitə bu anlayışların mənimsənilməsinə istiqamətləndiyi diqqət mərkəzinə çəkilir.

Məqalədə Azərbaycan ümumtəhsil məktəblərində Texnologiya fənn kurikulumunun strukturunun "blok-sxem" forması, "fənnin məzmunu bloku"nda özünə yer alan ümumi təlim nəticələri, məzmun xətləri, məzmun xətləri üzrə təlim nəticələri, məzmun standartları, inteqrasiya anlayışları "sistem-struktur" dialektik yanaşması əsasında aparılmış ümumiləşmələrin elmi şərhi təqdim edilir.

***Açar sözlər:*** *təhsil proqramı, kurikulum, fənn kurikulumu, "blok-sxem" forması, ümumi təlim nəticələri, məzmun xətti, məzmun standartları, məzmun elementləri, təhsilin pillə və səviyyələri, fəaliyyət xətləri, məişət mədəniyyəti, emal texnologiyaları, texnika elementləri, qrafika*

**Firadun Nadir Ibrahimov**
Sheki branch of ASPU
Doctor of Pedagogical Sciences
https://orcid org/0000-0002-0775-1048
firedun52@mail.ru
**Sevil Farrukh Ibrahimova**
Sheki branch of ASPU
https://orcid.org/0000-0002-8944-3611
ibrahimova_57@mail.ru

# Interpretation of the "subject content block" elements of the Technology subject Curriculum in Azerbaijan secondary schools based on the "system-structure" approach

## Abstract

The article emphasizes that the curriculum reform is conditioned by the need for the implementation of education in Azerbaijan to ensure its adherence to the challenges of the XXI century, to educate a creative, self-developing personality, and the content of the abilities necessary to become the subject of the student who has completed general education is indicated.

The importance of the educator's reference to the "system-structural" approach both in his knowledge of the essence of the educational program and in his practical activities related to its implementation, the focus of attention is drawn to the fact that subject-oriented curricula are aimed directly at mastering these concepts by covering the relevant field of science, its perfect system of concepts. The article presents the scientific interpretation of generalizations based on the dialectical approach "system-structure" of the structure of the Technology subject curriculum in general schools of Azerbaijan, the general training results contained in the "subject content block", the content lines, the training results on the content lines, the content standards, the concepts of integration.

***Keywords:*** *educational program, curriculum, subject curriculum, basic for "block-scheme", general training results, content line, content standards, content capturing points, levels and levels of education, lines of activity, everyday culture, processing technologies, elements of technique, graphics*

## Giriş

**Tədqiqat mövzusunun aktuallığı.** Müşahidələr göstərir ki, ümumtəhsil pilləsində Texnologiya fənn kurikulumunun tətbiqində təhsilverənlərin fəaliyyətində yanlışlıqlara yol verilir. Bu isə Texnologiya fənninin tədrisi prosesinin səmərəlilik səviyyəsinə mənfi təsir edir. Danılmazdır ki, hər hansı gerçək var olanın dərk olunma səviyyəsi ondan adekvat istiqamətlərdə faydalanmanın nəticələrinə müəyyənedici təsir göstərir. Son on ildən artıq zaman kəsiyində apardığımız elmi müşahidələrimiz əsasında qənaətə gəlmişik ki, Texnologiya fənn kurikulumundan istifadə prosesində praktik təhsilverənlərin fəaliyyətində təzahür edən yanlışlıqların əsasında bir sıra səbəblərlə yanaşı, həm də Texnologiya fənn kurikulumunun mahiyyətinin bu subyektlər tərəfindən kifayət qədər dürüst dərk olunmaması dayanır. Elmi fəaliyyət təcrübəmizə əsasən belə qənaətdəyik ki, "sistem-struktur" yanaşma istənilən mövcud olanın dərk edilməsinin, onun mahiyyətinə varmağın ən etibarlı dialektik metodudur. Toplamış olduğumuz materialların təhlili söyləməyə əsas verir ki, Texnologiya fənn kurikulumunun mahiyyətinin açılması və onun tətbiqi yollarının müəyyən olunması ilə bağlı bu metoddan nəzəri və texnoloji istiqamətlərdə yetərincə istifadə olunmamışdır. Odur ki, biz yuxarıda şərhi verilən yanlışlığın təzahürünə əsas yaradan problemin həllinə yönələn məsələlərdən birinin − "Azərbaycan ümumtəhsil məktəblərində Texnologiya fənn kurikulumunun "Fənnin məzmunu bloku" elementlərinin "sistem-struktur" yanaşma əsasında şərhi" kimi formulə edilməsini və onun aktual tədqiqat mövzusu olmasını iddia edirik.

**Tədqiqat materialları əsasında formalaşdırılmış ümumiləşmələrin şərhi.** Məlumdur ki, XXI əsrdə həm cəmiyyətin, həm də onun hər bir üzvünün yaşamasında və inkişafında başlıca dəyər yaradıcı, özünüinkişafetdirən şəxsiyyətdir (Veysova, 2007: 16). Təhsil də dəyişən dünyanın reallıqlarından kənarda mövcud ola bilməz. Müasir psixologiya məhz uşağın yaradıcılıq imkanlarının üzə çıxarılması və həyata keçirilməsi üçün əlverişli şəraitin yaradılmasını təhsilin başlıca məqsədi sayır (Əlizadə, 2004: 290-292). Odur ki, müasir zaman kəsiyində başlıca dəyər yaradıcı, özünüinkişafetdirən şəxsiyyət olduğundan, təhsil prosesi uşaqda məhz yaradıcılıq, özünüinkişaf qabiliyyətləri formalaşdırmalıdır. Bu da öz növbəsində aşağıda göstərilən fəallığa, dərk etmək tələbatına və qabiliyyətlərinə əsaslanır:

1) məntiqi düşünmə; 2) ətraf aləmin cisim və hadisələrinə tənqidi yanaşma; 3) müstəqil olaraq qərarçıxarma; 4) ətrafda olanları yaradıcı sürətdə dəyişmə; 5) bilikləri müstəqil əldəetmə; 6) praktiki problemləri həlletmə; 7) şəxsiyyətin inkişafına dair yeni məqsədlər qarşıya qoyma.

Ümumi təhsilini başa vurmuş şagirdin əldə etməli olduğu bacarıqları – ümumi təlim nəticələri ümumtəhsil məktəblərində tədris olunan bütün fənlərin (o cümlədən Texnologiya fənninin) tədrisi prosesində hədəflənən nəticələrin sintezi, dialektik vahidləşməsi kimi formalaşır.

Danılmazdır ki, Texnologiya fənnini tədris edən müəllimin ümumi təhsilin qarşısına qoyulmuş vəzifələri (gözlənilən ümumi nəticələri) dürüst şəkildə bilməsi xüsusi önəm daşıyır. Ancaq bu, məsələnin bir tərəfidir və tədris prosesi ilə bağlı fəaliyyətin nəticəyönəlişli sistemə salınması üçün gərəkdir. Belə ki, məqsəd fəaliyyətin sistemyaradıcı komponentidir. Bununla yanaşı, məqsədin hərəki hala gəlməsi üçün təlim prosesinin hansı məzmunda, hansı strategiya əsasında, hansı qiymətləndirmə mexanizmlərinə dayanaraq həyata keçirilməsi də olduqca mühüm əhəmiyyətə malikdir. “Ümumi təhsilin səviyyələri üzrə təlimin yeni zəruri minimumu, bilik həddi, fənn üzrə ümumi təlim nəticələri və qazanılacaq bacarıqların əvvəlcədən ümumi təhsilin ayrı-ayrı səviyyələrində əldə olunacaq təlim nəticələri ilə əlaqələndirilməsi təhsilin ən vacib problemlərindən biri hesab olunur” (Qasımova, Mirzəyeva, 2016: 71). Müəllim təlim prosesi ilə bağlı bütün suallara həm nəzəri, həm də əməli cavab tapmağı bacarmalıdır. O bilməlidir ki, fasilitatoru olduğu prosesdə hansı modeldən istifadə edir və bu modelin hansi məxsusi xüsusiyyətləri vardır. Bu model ənənəvi modellərin hansı üstün məziyyətlərini özündə cəmləşdirmişdir (unudulmamalıdır ki, yenilik köhnənin tamamilə inkarı deyildir, belə inkar xeyirdən çox ziyan gətirə bilər) və real pedaqoji prosesə hansı uğurları vəd edir. Söylədiklərimizi əsas götürərək ümumiləşmə edirik ki, hazırda ümumtəhsil məktəblərində tətbiq olunan “təlim prosesi ilə bağlı bütün fəaliyyətlərin səmərəli təşkilinə, məqsədyönlu və ardıcıl həyata keçirilməsinə imkan yaradan könseptual sədd kimi dərk olunan” (İbrahimov, 1998: 228-229) təhsil proqramının (kurikulumun) əsas xüsusiyyətlərinin “sistem-struktur” yanaşma əsasında interpretasiyasını vermək ümumi işin xeyrinə olar.

Müəllim təhsil proqramının reallaşdırılmasında “imkandaşıyıcılıq funksiyası”nın subyektlərindən biridir. Onun sözügedən proqramın mahiyyətinə nüfuzetmə səviyyəsi fəaliyyətinin səmərəliliyinə şərtləndirici təsir edir. Odur ki, həm proqramın mahiyyətinə bələd olmasında, həm də onun icrası ilə bağlı praktik fəaliyyətində “sistem-struktur” yanaşmaya istinad etməsi əhəmiyyətlidir, bizi bu qənaətə tədqiqat materiallarının və iş təcrübəmizin təhlili gətirir.

Burada vurğulamaq yerinə düşər ki, sistemin mahiyyəti onun strukturu ilə funksiyası, yəni elementlərin və onların davranışının əlaqələrinin xarakteri ilə, obyektin şəraitlə əlaqəsinin spesifikliyi ilə müəyyən edilir. Sistemi təşkil edən elementləri, bunların qarşılıqlı təsirini öyrənmədən buradakı davamlı, mühüm və zəruri əlaqələri ayırd etmək mümkün olmur. Elementlərin belə davamlı, mühüm və zəruri olan qarşılıqlı təsiri məhz sistemin strukturunu səciyyələndirir. Struktur elementlərin əlaqələri qanunu, sistemin invariantı kimi çıxış edir. Elementlərin, bunların əmələ gətirdiyi bütövlə, tamla əlaqəsini öyrənmədən, açmadan həm sistemin funksiyası, həm də hər bir elementin tama nəzərən funksiyaları kölgədə qalır. Tam anlayışı sistemə nəzərən mənalanır, o sistemin təşkilatlanmasıdır. Hər bir sistemin özünəməxsus strukturu və bu strukturun daşıyıcı olduğu funksiyası var. Sistemə onun struktur və funksiyasının vəhdətindən ibarət tam kimi baxıla bilər. Sistemlər bir-birindən təkcə struktur və funksiyalarına görə deyil, həm də başlıca olaraq struktur ilə funksiyanın vəhdətinin necəliyi, bu vəhdətin xarakteri ilə fərqlənirlər.

Təhsil proqramı (kurikulum) dövlət təhsil standartlarına uyğun ayrı-ayrı təhsil pillələri və səviyyələri üzrə təhsilin məzmununu və mənimsənilmə qaydalarını müəyyən edir (İbrahimov, 2016: 106-107). Təhsil proqramına tədris planı, fənlər üzrə tədris proqramları, metodik təminatla bağlı tövsiyələr, qiymətləndirmə və digər müvafiq təhsil texnologiyaları daxildir (İbrahimov, 1998: 173). Təhsil kurikulumları xarakterinə görə iki yerə ayrılır: fənyönümlü və şəxsiyyətyönümlü.

Fənyönümlü kurikulumlar məzmun etibarı ilə elm sahəsini, onun mükəmməl anlayışlar sistemini əhatə etməklə bilavasitə bu anlayışların mənimsənilməsinə istiqamətləndirilir. Şəxsiyyətyönümlü kurikulumlar bilavasitə həyati bacarıq və vərdişlərə üstünlük verilməsi ilə

fərqlənir. "Kurikulumun "şəxsiyyətyönümlülük", "şagirdyönümlülük" və "nəticəyönümlülük" yanaşmaları təlim prosesinin mərkəzində şagirdin olmasını göstərir" (Mirzəcanzadə, 1990).

Fənn kurikulumları (o cümlədən Texnologiya fənn kurikulumu): müxtəlif bacarıqların öyrənilməsini nəzərdə tutan balanslaşdırılmış və əhatəli yanaşmanı özündə saxlayır; təlimin fəal üsullarından istifadə olunmaqla məzmun standartlarının səviyyəsinə çatmağa imkan yaradır; şagirdlərin bilik və anlayılarının daim qiymətləndirilməsini, tədris ili ərzində düzəlişlərin edilməsini nəzərdə tutur; şagirdlərin təlimə cəlb olunmasını, davamlı təhsilə hazırlanmasını və həvəsləndirilməsini təmin edir; şagirdlərin təhsil alarkən, bilikləri qiymətləndirilərkən, savadları artırılarkən müasir texnologiyalardan istifadə edilməsini nəzərdə tutur; uyğun təlim resurslarına və inzibati yardıma malik olur (Abbasov, Cavadov, İbadova, Quliyeva, Sultanova, Cavadova: 189-190).Ümumiləşmə edərək söyləmək olar ki, Texnologiya fənn kurikulumu ümumtəhsil məktəblərində bu fənnin təliminin əsas məqsədlərini təyin etməklə ümumi təlim nəticələrinə nail olmaq istiqamətində bütün fəaliyyətləri əks etdirən və hər bir şagirdin imkan və ehtiyaclarına yönəldilmiş sənədlər toplusudur. Məzmun standartlarının müəyyənləşdirilməsi prosesində fənn üzrə əsas təlim nəticələrinin (hesablama prosedur bacarıqları, idraki dərketmə və problemlərin həlli) balansının gözlənilməsi diqqət mərkəzində saxlanılır. Kurikulum şagirdlərin "nəyi bilməli" və "nəyi bacarmalı" olduğunu müəyyənlədirmək üçün əsas təlim nəticələrini məzmun və fəaliyyət xətlərinin qarşılıqlı əlaqəsi vasitəsilə tədqim edir (Veysova, 2007).

Ümumtəhsil məktəblərində "Texnologiya" fənninin tədrisi şagirdlərin emal texnologiyalarından müstəqil həyatda istifadə etmələrinə, onlarda yaradıcılıq qabiliyyətinin formalaşdırılmasına, texniki sahələr üzrə təhsillərini davam etdirmələrinə hərtərəfli şərait yaradır. Təlim prosesində şagirdlər texniki fəaliyyət imkanlarını müəyyənləşdirir, problemlərin həlli üçün ideyalar irəli sürür, sadə texnoloii işləri yerinə yetirir və nəticələri qiymətləndirmək imkanı əldə edirlər. Eyni zaman da bu fənnin tədrisi şagirdlərin xarakterinin formalaşdırılmasına, onların mənəvi, intellektual və estetik inkişafına, dövrə uyğun texnoloği bacarıqlar əldə etməklə sosial-iqtisadi şəraitə uyğunlaşmalarına zəmin yaradır. Bunlarla yanaşı, həmin fənn vasitəsilə şagirdlər ayrı-ayrı xidmət sahələri üzrə məhsuldar əməyə hazırlanır, onların politexnik dünyagörüşü genişlənir və şüurlu peşə seçmələri təmin olunur. Bu fənni öyrənməklə şagirdlər kompüter texnikası və müasir texnologiyalarla ətraflı tanış olur, istehsalatdakı emal texnologiyalarına aid bilik və bacarıqlara yiyələnir, qarşıya çıxan problemləri həll etmək qabiliyyətləri əldə edirlər. "Texnologiya" fənninin məqsədi yeni sosial-iqtisadi şəraitdə şagirdlərin müstəqil həyata, kütləvi və perspektivli peşələrə hazırlanmalarını, ümuməmək bacarıq və vərdişlərinə yiyələndirmələrini, yaradıcı düşüncə və aktiv fəaliyyət əsasında müxtəlif şəraitlərə asanlıqla uyğunlaşmalarını təmin etməkdən ibarətdir. Məlum olduğu kimi, "uşağın yaradıcılıq imkanlarının üzə çıxarılması və bunların reallaşdırılması, şəxsiyyətinin formalaşması üçün əlverişli şəraitin yaradılması təhsilin başlıca məqsədlərindəndir" (İbrahimov, 2018: 290-292). Şübhə yoxdur ki, ümumi təhsilin həyata keçirilməsinin əsas imkandaşıyıcı komponentlərindən olan fənlər məktəblilərin şəxsiyyətinin formalaşmasında mühüm vasitə kimi yüksək dəyər kəsb edir. Fənlərin "imkandaşıyıcılıq" funksiyaları Azərbaycan Respublikasının Təhsil Qanunu"nda aşağıda özünə yer alan məzmunda ifadəsini tapmışdır:

- təhsilalanlara elmlərin əsaslarının öyrədilməsini, zəruri bilik, bacarıq və vərdişlərin aşılanmasını, onların həyata və əmək fəaliyyətinə hazırlanmasını təmin edir;
- təhsilalanların fiziki və intellektual inkişafına, zəruri biliklərə yiyələnməsinə, onlarda sağlam həyat tərzinə və sivil dəyərlərə əsaslanan vətəndaş təfəkkürünün formalaşmasına, milli və dünyəvi dəyərlərə hörmət hissinin aşılanmasına, ailə, cəmiyyət, dövlət və ətraf mühit qarşısında hüquq və vəzifələrinin müəyyən edilməsinə imkan yaradır (Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu, 2010: 21-23).

Rəsmi dövlət sənədlərinə əsaslanaraq "ümumtəhsil fənlərinin mündərəcəsi təhsilin müxtəlif səviyyələrində fəqlənməklə aşağıdakı kimi iyearxik məqsədləri hədəfləyir" fikrini söyləyə bilərik:

- ibtidai təhsil səviyyəsində təhsialanlarda oxumaq, yazmaq və hesablama bacarıqları aşlamaq, onlarda insan, cəmiyyət və təbiət haqqında ilkin biliklər, məntiqi təfəkkür elementləri, estetik və bədii zövq və digər xüsusiyyətlər formalaşdırmaq;

- orta təhsil səviyyəsində təhsilalanlarda şifahi nitq və yazı mədəniyyətini, ünsiyyət bacarığını, idrak fəallığını, məntiqi təfəkkürün inkişafını, təhsil proqramına daxil olan fənlər üzrə, eləcə də dünya sivilizasiyasının inkişafı haqqında müvafiq bilik və təsəvvürlərin formalaşdırılmasını, müasir informasiya-kommunikasiya vasitələrindən istifadə etmək qabiliyyətini, hadisələri qiymətləndirmək və öz gələcək fəaliyyət istiqamətlərini müəyyənləşdirmək bacarığını təmin etmək;
- tam orta təhsil səviyyəsində təhsilalanlarda istedad və qabiliyyətlərin reallaşdırılmasını, müstəqil həyata və peşə seçiminə hazırlanmasını, fəal vətəndaş mövqeyinin, milli və ümumbəşəri dəyərlərə, insan hüquqlarına və azadlıqlarına hörmət hissinin və tolerantlığın formalaşdırılmasını, müasir informasiya-kommunikasiya texnologiyalarından və digər texniki vasitələrdən sərbəst istifadə etməsini, iqtisadi biliklərin əsaslarına yiyələnməsini, xarici dillərin birində, yaxud bir neçəsində ünsiyyət saxlamasını və s. təmin etmək (daha ətraflı məlumat üçün bax (Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu), 2007):

Sözügedən bilik, bacarıq və vərdişlər sistemində Texnologiya fənninin tədrisində müxtəlif təhsil səviyyələri üzrə əldə olunanlar komponent qismində ehtiva olunur. Sözügedən komponentlər aidiyəti rəsmi sənəddə öz ifadəsini tapmışdır. “Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurrikulumu)” çərçivə sənədinə uyğun olaraq ümumtəhsil məktəblərində “Texnologiya” fənninin vəzifələri aşağıdakı kimi müəyyənləşdirilmişdir:

İbtidai təhsil səviyyəsində şagirdlərdə müqayisə və çeşidləmə, ilkin emal, özünəxidmət və birgəfəaliyyət vərdişləri, sadə layihələndirmə, tərtibat, modelləşdirmə, dizayn, canlı təbiətə xidmət bacarıqları, ölçü, mütənasiblik, simmetriya və digər həndəsi anlayışlar formalaşdırılır, sadə konstruksiyalar və yaradıcı işlərin yerinə yetirilməsi üzrə qabiliyyətlərin aşılanması təmin olunur.

Əsas təhsil səviyyəsində ibtidai təhsil səviyyəsində təyin olunmuş funksional vəzifələrin yerinə yetirilməsi istiqamətində nəzərdə tutulan fəaliyyətləri inkişafı etdirməklə texnoloji və tətbiqi bacarıqların təkmilləşdirilməsi, sadə olmayanı texnoloji proseslərin həyata keçirilməsi, yaradıcı texniki təfəkkürün formalaşdırılması, şagirdlərin müasir informasiya texnologiyalarından istifadə imkanlarının genişləndirilməsi, onların peşəseçməyə istiqamətləndirilməsi, zəhmətsevərlik və yaradıcılıq ruhunda tərbiyə edilməsi təmin olunur.

Məzmun xətti fənn üzrə ümumi təlim nəticələrinin reallaşdırılmasını təmin etmək üçün müəyyən edilən məzmunun zəruri hesab olunan hissəsidir. Məzmun xətləri şagirdlərin öyrənəcəyi məzmunu daha aydın təsvir etmək üçün müəyyən olunur və onu sistemləşdirmək məqsədi daşıyır.

Milli və dünya təcrübəsinin öyrənilməsi, onların müqayisəsi, təhlil edilməsi nəticəsində “Texnologiya” fənninin aşağıda qeyd olunan məzmun xətləri müəyyənləşdirilmişdir ki, bu da şagirdlərin əldə edəcəyi bilik və bacarıqları daha aydın təsvir etmək, onu sistemləşdirmək məqsədinə xidmət edir: Emal texnologiyaları; Texnika elementləri; Məişət mədəniyyəti; Qrafika.

Bütün fənlərdə olduğu kimi, texnologiya fənninin məzmunu sinifdən-sinfə, konsentrik əsasda sadədən mürəkkəbə, asandan çətinə prinsipi üzrə getdikcə zənginləşsə də, məzmun xətləri dəyişməz qalır. Texnologiya fənninin məzmun xətləri kurikulumun quruluşunu tərtib etməyə və bu halda mülahizə yürütməyə xidmət edir. Qeyd etmək lazımdır ki, fənnin məzmununa daxil olan hər hansı bir anlayış və ya bacarıqlar yalnız bir məzmun xətti çərçivəsində məhdudlaşmaya bilər. Məzmun xətləri müəyyənləşdirərkən, nəzərdə tutulur ki, Texnologiya fənninin təlimində siniflər üzrə onların hər birinə eyni dərəcədə əhəmiyyət veriləcəkdir. Fənnin məzmunu sinifdən-sinfə keçdikcə dəyişdiyindən xətlərin hər birindəki məzmun və onların ümumi məzmundakı çəkisi də nəzərəçarpacaq dərəcədə dəyişir. Məzmun xətləri əsasında hazırlanmış kurikulum geniş məzmun diapazonunu özündə əks etdirməlidir. İnteqrativ şəkildə tədris olunan bu geniş məzmun imkan verir ki, şagirdlər müxtəlif həyati bilklərin bir-biri ilə əlaqəsini təkcə Texnologiya fənni daxilində deyil, həmçinin digər fənlərdə və real həyatda olduğunu da anlasınlar.

Elmi mənbələrdə vurğulanır ki, məzmun standartı-dövlətin təhsilalanın bilik və bacarıq səviyyəsinə qoyulmuş dövlət tələbidir (Abbasov, Məmmədzadə, Məmmədli: 468). Texnologiya fənni üzrə standartlar orta təhsil kursu çərçivəsində bütün şagirdlər üçün vacib olan məzmunu əhatə edir, şagirdlərin Texnologiya fənni üzrə bilik və bacarıqlarını təsvir edir, ölkədə hər bir şagirdin

həyat bilgiləri sahəsində öyrənə biləcəyi və öyrənməli olduğu məsələləri müəyyən edir, şagirdləri orta təhsilin sonrakı pilləsinə hazırlayır. Standartların məzmununun təyin edilməsinə yeni yanaşmada nəzərdə tutulmuşdur ki, hər bir standart müəyyənləşdirilmiş bir neçə məqsəddən (alt standartdan) ibarət olur və müvafiq qaydada genişlənən tutumla bütün siniflər boyu təkrarlanır.

Texnologiya fənninin məzmun standartları siniflər üzrə sistemləşdirilmiş və yuxarıda göstərilən dörd məzmun xətti üzrə təmsil olunmuşdur. Hər bir standart məqsədi ibtidai, orta təhsil səviyyələrinə uyğun müəyyənləşdirilmiş bir neçə gözlənilən təlim nəticəsini əhatə edir. Texnologiya fənninin tədrisinin və mənimsənilməsinin tərkib hissəsi bir-birindən təcrid olunmamışdır, əksinə, onlar bir-biri ilə bağlıdır və bir-birini tamamlayır.

Əsas standartın funksiyası müəyyən olunan təlim nəticələrini məzmun xətləri üzrə ümumi şəkildə izah etməklə bağlıdır. Alt standartların funksiyalarına aid edilir: təlim məqsədlərinin dəqiq müəyyən olunması üçün etibarlı zəmin yaradır; təlim strategiyalarının düzgün seçilməsində mühüm rol oynayır; təlimdə inteqrativliyi təmin edir; təlimin məzmununun davamlı inkişafını təmin edir; sinif və fənlər üzrə summativ qiymətləndirmənin aparılmasını təmin edir.

“Texnologiya” fənni üzrə məzmun standartlarının reallaşdırılması aşağıdakı fəaliyyət xətləri üzrə həyata keçirilir: Problem həlli; Təhliletmə və əsaslandırma; Mühakiməyürütmə; Əlaqələndirmə; Təqdimetmə. Fəaliyyət xətləri məzmun xətlərindən fərqlənməklə yanaşı, onların hər biri ilə əlaqəlidir. Bu xətlər məzmun üzrə biliklərin əldə edilməsi və istifadəsi yollarını müəyyənləşdirmək, onları təsvir etmək məqsədi daşıyır və şagirdlər tərəfindən informatika fənninin əhəmiyyətinin dərk edilməsinə, ona kompleks bacarıqların toplusu kimi baxılmasına xidmət edir.

Şagird Texnologiya fənnindən mənimsəyəcəyi məzmuna müxtəif fəaliyyətlər vasitəsilə nail ola bilər. Məzmunun mənimsənilməsi prosesində şagird fəaliyyətinin müxtəlif mərhələləri qazanılmış bilik və bacarıqların daha möhkəm və uzunmüddətli olmasını təmin edir. Fəaliyyyət standartları kurikulumun həyata keçirilməsi üçün məzmun standartlarının şagirdlərə mənimsədilməsini təmin edir. Hər bir fəaliyyət standartları təhsil pilləsində nəyin əhatə olunduğunu və məzmun standartına nail olmaq üçün müəllimin rolunun nədən ibarət olduğunu ifadə edir. Qeyd etmək lazımdır ki, hər bir fəaliyyət standartı bütün siniflərdə istifadə olunmaqla təhsil səviyyələri və siniflər üzrə getdikcə dəyişir. Ona görə də bu standartların ümumi şəkildə qəbul edilməsi əlverişlidir.

Məzmun standartlarının bilik və fəaliyyət komponentləri, onların təsnifatı belədir (bax: Sxem1).

**Sxem 1.**



Kurikulum nəzəriyyəçiləri standart tərtibatçılarına kömək məqsədilə təhsil üçün yararlı hesab edilən hər üç taksonomiyanın (idraki, emosional, psixomotor) bütün mərhələlərini ifadə edən felləri müəyyənləşdirmişlər. Fellər bacarıqların ifadə edilməsində çox mühüm göstəricidir. Fel bacarığın taksonomiyasının hansı mərhələsinə aid olduğunu əks etdirir (Kərimov, 2008: 41).

Taksonomiyalar təlimi daha ardıcıl və səmərəli qurmağa zəmin yaradır. Taksonomiyalar təlim prosesində böyük rol oynayır.

Bunlar aşağıdakı imkanları yaradır: təlim məqsədlərini düzgün müəyyənləşdirmək; problemləri düzgün müəyyənləşdirmək və şagirdlər üçün tapşırıqları tərtib etmək; qoyulmuş məqsədlərə uyğun qiymətləndirmə vasitələri seçmək; təlim nəticələrinə əsaslanaraq refleksiyanı düzgün keçirmək; bu və ya digər materialın öyrənilməsində şagirdlərin hansı çətinliklərlə qarşılaşdıqlarını müəyyən etmək.

Təhsil prosesində şagirdlərin qazanıb gündəlik həyatlarında tətbiq edə biləcəkləri bilik, bacarıq və vərdişlərin formalaşdırılması həm fənlərin, həm də onların əhatə etdikləri mövzuların əlaqəli-inteqrativ şəkildə tədrisini tələb edir. İnteqrasiya – müəyyən təhsil sistemi çərçivəsində şagirdlərin təfəkküründə dünyanın bütöv və bölünməz obrazını formalaşdırmaq, onları inkişafa, özünüinkişafa istiqamətləndirmək məqsədilə təlimin bütün məzmun komponentləri arasında struktur əlaqələri qurmaq və onları sistemləşdirməkdir. Müasir dünya təcrübəsində inteqrasiyanın 3 səviyyəsini fərqləndirirlər.

Fəndaxili inteqrasiya müəyyən bir fənnin aşıladığı anlayış, bilik və bacarıqların əlaqələndirilməsi fənn daxilindəki faktların sistemləşdirilməsidir. Belə səviyyədə inteqrasiyanı verilmiş materialın ayrı-ayrı tədris vahidlərində cəmləşdirilməsi də hesab etmək olar. Bu isə son nəticədə fənnin məzmununun strukturunun dəyişdirilməsinə gətirib çıxarır. Bu mənada inteqrasiya olunmuş məzmun innovativ cəhətdən daha tutumlu olur, şagirdlərin daha əhatəli kateqoriyalarla düşünmə bacarıqları formalaşdırmalarına kömək edir. Fəndaxili inteqrasiya həm üfüqi, həm də şaquli ola bilər.

Müasir dünyada sürətlə gedən sosial, mədəni və texnoloji dəyişikliklər qlobal düşünmə tərzinin əhəmiyyətini xeyli artırır. Belə olan halda təlim prosesin də şagirdlərə ayrı-ayrı fənlər üzrə verilən bilik və bacarıqların passiv istehlakçısı deyil, əksinə, ətraf aləmin dərk edilməsinə yaradıcı təfəkkürlə münasibət bəsləyən subyektlər kimi yanaşılmasına gətirib çıxarır. Bu isə o zaman mümkündür ki, təhsil pillələrində öyrənilən fənlər və onların əhatə etdiyi mövzular ayrı-ayrı deyil, əlaqəli-inteqrativ şəkildə tədris olunsun.

Fənlərarası inteqrasiya iki və ya daha artıq fənnin əhatə etdiyi anlayış, bilik, bacarıq və prinsipin sintezidir. Bu inteqrasiya bir fənnə aid olan qanun, nəzəriyyə və metodların başqa bir fənnin öyrənilməsində ifadəsini nəzərdə tutur. Məzmunun bu modelə uyğun sistemləşdirilməsi şagirdlərin təfəkküründə dünyanın bütöv və bölünməz obrazının yaradılması ilə yanaşı, həm də ümumelmi anlayışlar, kateqoriyalar və yanaşmalarla xarakterizə olunan yeni tip biliklərin formalaşdırılmasına təkan verir. Müxtəlif fənlərə aid oxşar və bir-birini tamamlayan mövzular elə planlaşdırılır və tədris olunur ki, onlar üçün müəyyən bir çərçivə yaranır, yəni eyni vaxtda tədris olunur.

Fənlərüstü (transfənn) inteqrasiya − inteqrasiyanın ən yüksək səviyyəsi olmaqla özündə təlimin əhatə etdiyi əsas və əlavə məzmun komponentlərinin sintezini ehtiva edir. Yəni bu inteqrasiya ilə şagirdlərin məktəbdə öyrəndikləri məzmunla məktəbdən kənarda aldıqları məzmun sintez edilir. İnteqrasiyanın belə səviyyəsini, şəbəkəsi getdikcə artmaqda olan məktəb-komplekslərlə yanaşı, həm təhsil paradiqmalarının dəyişməsi və yeni nəslin icmalarda formalaşdırılması ideyası da tələb edir (Əhmədov, Abbasov, 2008: 171).

Texnologiya fənni bütün inteqrativ fənlərin tədrisi kimi yalnız fəndaxili, fənlərarası və fənlərüstü inteqrasiyanı yox, həm də təlim metod və texnologiyalarının inteqrasiyasını nəzərdə tutur.

**Tədqiqat işinin elmi yeniliyi və nəzəri əhəmiyyəti.**

1) Texnologiya fənn kurikulumunun mahiyyətinin açılması və onun tətbiqi yollarının müəyyən olunması ilə bağlı dialektikanın mühüm qolu kimi formalaşmış “sistem-struktur” yanaşma

metodunun tətbiqinin əhəmiyyətliliyi tədqiqatçıların diqqətinə çatdırılmışdır; 2)"Azərbaycan ümumtəhsil məktəblərində Texnologiya fənn kurikulunun mahiyyətinin açılması və onun tətbiqinin optimal variantda işlənilməsi probleminin həllini şərtləndirən idrak məsələlərindən birinin həlli- "Azərbaycan ümumtəhsil məktəblərində Texnologiya fənn kurikulumunun "Fənnin məzmunu bloku" elementlərinin "sistem-struktur" yanaşma əsasında şərhi" təqdim olunmuşdur.

**Tədqiqat işinin praktik əhəmiyyəti.**

Ümid edirik ki, Azərbaycan ümumtəhsil məktəblərində tətbiq edilən Texnologiya fənn kurikulunun mahiyyətinin açılması və onun tətbiqinin optimal variantda işlənilməsi probleminin həllini şərtləndirən mühüm idrak məsələlərindən birinin həllinin − "Azərbaycan ümumtəhsil məktəblərində Texnologiya fənn kurikulumunun "Fənnin məzmunu bloku" elementlərinin "sistem-struktur" yanaşma əsasında şərhi"nin təqdim olunması Texnologiya fənn kurikulumunun tətbiqində təhsilverənlərin fəaliyyətində təzahür edən yanlışlıqların aradan qaldırılması mühitinin formalaşmasına müsbət təsir edəcəkdir.

## Nəticə

1) Hər hansı gerçək var olanın dərk olunma səviyyəsi onundan adekvat istiqamətlərdə faydalanmanın nəticələrinə müəyyənedici təsir göstərir. 2) Ümumtəhsil pilləsində Texnologiya fənn kurikulumunun tətbiqində təhsilverənlərin fəaliyyətində yanlışlıqlara yol verilməsi Texnologiya fənninin tədrisi prosesinin səmərəlilik səviyyəsinə mənfi təsir edir; 3) Texnologiya fənn kurikulumundan istifadə prosesində praktik təhsilverənlərin fəaliyyətində təzahür edən yanlışlıqların əsasında bir səbəblərlə yanaşı, həm də Texnologiya fənn kurikulumunun mahiyyətinin bu subyektlər tərəfindən kifayət qədər dürüst dərk olunmaması dayanır; 4) "Sistem-struktur yanaşma" istənilən mövcud olanın dərk edilməsinin, mahiyyətinə varmağın ən etibarlı dialektik metodudur; 5) Texnologiya fənn kurikulumunun mahiyyətinin açılması və onun tətbiqi yollarının müəyyən olunması ilə bağlı "sistem-struktur yanaşma" dialektik metodundan nəzəri və texnoloji istiqamətlərdə istifadə olunmamışdır; 6) Texnologiya fənn kurikulumunun mahiyyətinin açılması və onun tətbiqi yollarının müəyyən olunması ilə bağlı "boşluğun" şərtləndirdiyi yanlışlığın təzahürlərinə əsas yaradan problemin həllinə yönələn idrak məsələlərindən biri "Ümumtəhsil pilləsində Texnologiya fənn kurikulumun "Fənnin məzmunu bloku elementlərinin" "sistem-struktur" yanaşma əsasında şərhi"dir və bu istiqamətdə təqdim olunan tədqiqat ümumiləşməmiz fənninin tədrisi prosesinə fayda verir.

## Ədəbiyyat

1. Veysova, Z. (2007). Fəal/interaktiv təlim (Müəllimlər üçün vəsait). Bakı.
2. Əlizadə, Ə.Ə. (2004). Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: "Pedaqogika".
3. Qasımova, L.N., Mirzəyeva, Ş.İ. (2016). Azərbaycan təhsilində kurikulum konsepsiyası (Dərs vəsaiti). Bakı: "Elm və təhsil".
4. İbrahimov, F.N. (1998). Təlimdə alqoritmik və evristik fəaliyyətin optimal nisbətlərinin əsaslarına dair oçerklər. Bakı: "Mütərcim".
5. İbrahimov, F.N. (2016). Ümumtəhsil məktəblərində riyaziyyatın kurikulum modelinə əsaslanan tədrisi metodikası (Dərs vəsaiti). Bakı: "Mütərcim".
6. Mirzəcanzadə, A.X. (1990). İxtisasa giriş (Dərs vəsaiti). Bakı: Bakı Universiteti Nəşriyyatı.
7. Abbasov, Ə.M., Cavadov, İ.A., İbadova, B.O., Quliyeva, K.R., Sultanova, İ.N., Cavadova, S.E. (2019). Kurikulum bələdçisi: İzahlar və tətbiqlər. Bakı: "Elm və təhsil".
8. İbrahimov, F.N. (2018). Orta ümumtəhsil məktəblərində riyazi təhsilin fəlsəfəsi, didaktikası, həyata keçirilmə texnologiyası (Dərs vəsaiti). Bakı: "Mütərcim".
9. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. (2010). Bakı: "Qanun".
10. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). (2007). "Azərbaycan məktəbi" jurnalı, № 2.

11. Abbasov, A.N., Məmmədzadə, R.R., Məmmədli, L.A. (2021). Pedaqogika: Müntəxəbat (Ali təhsil müssisələri üçün dərs vəsaiti). Bakı: "Mütərcim".
12. Kərimov, Y.Ş. (2008). Kurikulum islahatı təhsilimizin əsasıdır. "İbtidai məktəb və məktəbəqədər tərbiyə" jurnalı, №1.
13. Əhmədov, A., Abbasov, Ə. (2008). Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: "Təhsil".

Göndərildi: 19.10.2022 Qəbul edildi: 23.01.2023

DOI: https://doi.org/10.36719/2663-4619/87/17-22

**Firuzə Fikrət qızı Kərimova**
Bakı Slavyan Universiteti
filologiya üzrə fəlsəfə doktoru
firuza.karimova.fk@gmail.com

# İNGİLİS DİLİNDƏ ATALAR SÖZLƏRİ VƏ ZƏRBİ-MƏSƏLLƏRİN TARİXİ

**Xülasə**

Məqalənin məqsədi ingilis dilinin tarixi və atalarımızın yaratdığı və əsrlərdən bəri özünə həyat düsturu etdiyi hikmətli və möcüz sözlərini nəzərdən keçirməkdir. İngilis dilinin xarakterik cəhətlərindən biri onun qısa sözlərdən ibarət olmasıdır. Mövzu müxtəlifliyi ilə yanaşı, bitmiş fikir, ümumiləşdirmə və nəticə atalar sözlərinə xas olan cəhətlərdir. Atalar sözləri xalqın həyatda sınanmış, müdrik və nəsihətli fikirlərindən ibarət olur və böyük əxlaqi-tərbiyəvi əhəmiyyət daşıyır. Tədqiqat işində ingilis dilində işlənən atalar sözləri və məsəllərin əksəriyyətinin mənşəyi araşdırılmışdır.

***Açar sözlər:*** *dilin tarixi, ingilis dili, atalar sözləri, məsəllər, dil faktları*

**Firuza Fikrat Karimova**
Baku Slavic University
Doctor of Phylology
firuza.karimova.fk@gmail.com

## The history of proverbs and sayings in English

**Abstract**

The purpose of the article is to review the history of the English language and the wise and miraculous words created by our forefathers and used as a formula for life since centuries. One of the characteristic features of the English language is that it consists of short words. In addition to the variety of topics, the finished idea, generalization, and conclusion are characteristic features of proverbs. Proverbs consist of life-tested, wise and admonishing ideas of the people and have great moral and educational importance. The origin of most of the proverbs and proverbs used in the English language was investigated in the research work.

***Keywords:*** *history of language, English language, proverbs, sayings, language facts*

## Giriş

Müasir dövrümüzdə ingilis dili siyasi danışıqlar və biznes dilinə çevrilib. Əsas elmi və tibbi araşdırmalar da ingilis dilində aparılır. Beynəlxalq razılaşmalara əsasən, təyyarələrdə işləyən bələdçilər ingilis dilini bilməlidir. Cənubi Amerika və Avropa məktəblərində ən çox tədris olunan dil ingilis dilidir. Filippində və Yaponiyada uşaqlar ingilis dilini ən kiçik yaşlarından öyrənməyə başlayırlar. İngilis dili Britaniya, Kanada, Birləşmiş Ştatlar, Avstraliya və Cənubi Afrika daxil olmaqla, yetmiş beşdən çox ölkənin rəsmi dilidir. Müxtəlif dillərin danışıldığı ölkələrdə insanların bir-biri ilə ünsiyyətini təmin etmək üçün çox vaxt ingilis dili rəsmi dövlət dili kimi çıxış edir. Hindistan buna yaxşı misaldır. İngilis dili 24 müxtəlif dilin hər birində bir milyondan artıq insanın danışdığı bu ölkədə hamı üçün ümumi dildir. Maraqlıdır ki, britaniyalıların özləri ana dilləri bütün dünyada genişlənən və ən populyar dil olmasına baxmayaraq, onu perspektivli hesab etmirlər. Təhsilin və mədəni əlaqələrin imkanlarını öyrənən “Britaniya şurası” İctimai-Siyasi Təşkilatı “Gələcəyin dilləri” ilə bağlı tədqiqatlarında müasir reallıqlar baxımından çıxış edib. Belə ki, təşkilatın üzvləri gələcəyin dilləri kimi ərəb, ispan, çin, portuqal, türk, yapon və rus dilini top onluğa daxil ediblər. Onlar hesab edirlər ki, yaxın 20 il ərzində bütün dünya ölkələri olmasa belə, əksər ölkələr, hətta ingilislərin özləri də bu dilləri iqtisadi, geosiyasi, mədəni, təhsil və sənaye

ehtiyaclarının ödənilməsinə görə strateji dil kimi qiymətləndiriblər. Belə ki, top onluqdakı dillər ölkənin xarici ticarət əlaqələri, diplomatik təhlükəsizliyin prioritetləri və internetdəki genişlənən dillərinə çevriləcək.

Bəzi ekspertlər hesab edirlər ki, ölkələrinin təkcə böyük Britaniya və ingilisdilli ölkələrlə deyil, həmçinin Almaniya, iqtisadi cəhətdən inkişaf edən Çin və s. ölkələrlə əlaqələri də genişlənib. Belə ki, dünyanın bir çox ölkələrində ana dili ingilis dili olmayan təhsil müəssisələri var və onlar beynəlxalq reytinqlərdə kifayət qədər yüksək yer tuturlar. İngiltərə və ABŞ universitetlərindən fərqli olaraq onlarda təhsil pulsuzdur. Mədəni tarixi əlaqələrə gəlincə, Fransanın və Yaxın Şərqin mədəniyyəti heç də bu gün özünü diqtəedici funksiyada görən dövlətlərdən geri qalmır. O cümlədən, rus dilini öz ana dilləri ilə paralel öyrənən insanlar üçün alman dilini öyrənmək ingilis dilini öyrənməkdən daha asandır (2).

İngilis dili geneoloji bölgüyə əsasən Hind-Avropa dilləri ailəsinin german qrupuna daxildir. Bu dil müxtəlif etnik qrupların Böyük Britaniya adalarında çarpazlaşması və yerləşməsi şəraitində təşəkkül tapmış və öz inkişafı prosesində uzun və mürəkkəb bir yol keçmişdir (İngilis dili üzrə 400 mövzu, 2006).

İngilis dilinin yaranma tarixi üç dövrə bölünür:

1. Qədim ingilis dili dövrü – V əsrdən XI əsrin sonuna qədər (449-1100) german tayfaları Britaniya adalarını fəth etmişdir. Bu dövrdə ingilis dili german dillərinin güclü təzyiqi və təsirinə məruz qalmış, german dillərində danışan gəlmə tayfaların dili hakim mövqe tutmuşdur. Müasir ingilis dili Britaniya adalarını fəth etmiş german tayfalarının dili əsasında təşəkkül tapmağa başlamışdır. İngilis dilinin German dilləri qrupuna daxil olması bununla izah olunur (Rəhimov, 1966). Məsələn:

Brider – brother – qardaş

Winter – winter – qış

Alt – old – qoca, köhnə

2. Orta ingilis dili dövrü – XI əsrin sonlarından XV əsrin sonlarına qədər olan dövrü əhatə edir. Müasir ingilis dilində işlənən külli miqdarda fransız sözləri ingilis dilinin lüğət fonduna daxil olması aşağıdakı misallarla izah olunub:

Cause – səbəb

Chief – rəis, başçı

3. Yeni ingilis dili dövrü – XV əsrin sonlarından hal-hazıra qədər olan dövrü əhatə edir.

Hər üç dövrdə ingilis dili normallaşmış, sabitləşib və zənginləşmişdir. Bu dil zaman keçdikcə dəyişmiş və təkmilləşmişdir.

Hazırda ingilis ədəbi dilinin əsasını London dialekti təşkil edir (Nağıyeva, 1971: 12).

Ekspertlər bu bölgədəki insanların proto-hind-Avropa dilində danışdığını söyləyir. Bu dil artıq mövcud deyil və buna görə də mütəxəssislər onun nə cür səsləndiyini bilmir. Amma Avropa dillərinin çoxunun əsasında məhz proto-hind-Avropa dili durur. Buraya qədim yunan, alman və latın dilləri daxildir. Latın dili danışıq dili kimi artıq mövcud deyil. Lakin müasir ispan, fransız və italyan dillərinin kökü latın dilindən gəlir. Qədim alman dili holland, Danimarka, alman, Norveç, İsveç və ingilis dilinin formalaşmasına gətirib çıxarmış dillərdin birinin əsasını təşkil edir.

Dil tarixi dil yaranan gündən baş verən bütün tarixi dəyişiklikləri özündə ehtiva edir. Dildə baş verən dəyişikliklər birbaşa dilin öz daxili amilləri ilə əlaqədar olanda linqvistik, cəmiyyətin ümumi inkişafı, xalqın tarixi ilə əlaqədar olduqda isə ekstarlinqvistik amillər adlanır. Dilin sözalınmasına təkan verən və mane olan bir sıra səbəblər mövcuddur. Alınma sözə müraciət etmək intralinqvistik və ekstralinqvistik səbəblər kompleksindən bəhrələnir. Ekstralinqvistik səbəblərə siyasi, iqtisadi, sosial, mədəni sahələrdəki dil əlaqələri daxildir. Əvvəl məlum olmayan predmet və hadisələrin adlandırılması zərurəti başqa dildən sözalmanın səbəbinə çevrilir. Belə səbəblər isə az deyildir. Ekstralinqvistik amillər cərgəsində psixoloji, estetik, evfemistik ifadəyə canatma olduğu kimi, sözalma prosesində əhəmiyyətli rol oynayan tarixi şərait, dini mənsubluq, ölkənin siyasi vəziyyəti kimi şərtlər də az deyildir. Dil və mədəniyyət bir-birilə sıx əlaqədə olub, daima bir birini zənginləşməsində və inkişafında əvəz edilməz rol oynamışdır. Məhz bu cür əlaqəni, dilin və

mədəniyyətin bir birinə təsir etmə səbəbləri, üsullarını və inkişaf tarixini müşahidə etməyin ən gözəl yolu ədəbiyyat nümunələridir. Məhz orta əsr Britaniya ədəbiyyatlarına nəzər saldıqda Britaniyanın necə multikultural ölkə olduğunu daha aydın görmək olur.

XIII əsrdə yaşamış tarixçi və keşiş Breyklondunlu Coselin "Chronicle of the Abbey of Bury St.Edmunds" əsərinə nəzər yetirsək, orta əsr insanın özünündə üç mədəniyyəti əxz etdiyini görə bilərik. Coselin latın dilində yazdığı əsərinin qəhrəmanı olan Abbot Sampton haqqında bunları deyir: "Homo erat eloquens, Gallice et Latine, magis rationi dicendorum quam ornatui uerborum innitens. Scripturam Anglice scriptam legere nouit elegantissime, ett Anglaice sermocinare solebat populo, et secundum linguam Norfolchie, ubi natus et nutritus erat, unde et pulpitum iussit fieri in ecclesia et ed utilitatem audiencium et ad decorem ecclesie" (Abbasova, 1995). Əsərdən belə aydın olur ki, əsərin qəhrəmanı 3 dil bilir.

Eyni zamanda XII əsrin sonlarda və XIII əsrin əvvəllərində ana dili üzərində üstün mövqe tutan fransız və latın dilini bilməsi, din xadimləri ilə ünsiyyətdə olan zaman latın dilində sərbəst ünsiyyətə girməsi, eyni zamanda hakimiyyət nümayəndələri ilə ünsiyyətdə olan zaman sərbəst fransız dilində danışa bilməsi onu dövrünün ən mədəni və savadlı insanı edirdi. Qədim ingilis dilini başa düşmək olduqca çətindir. İngilis dilinin bu qədim formasında yazı nümunələrini yalnız bəzi ekspertlər oxuya bilir. Bu dövrdən bir neçə yazı nümunəsi qalıb. Bu, qəhrəman krala həsr olunmuş "Beovulf" poemasıdır. Tədqiqatçılar peomanın VII – VIII əsrlərə aid olduğunu bildirir. Poemanın müəllifinin kim olduğu məlum deyil (Dil və ədəbiyyat, 2019).

Təxminən min yüz il bundan əvvəl Britaniya yenidən, bu dəfə şimaldan *vikinqlər* tərəfindən istila edilir. Danimarka, Norveç və başqa şimal ölkələrindən gələn *vikinqlər* ticarət yollarını genişləndirmək və qul bazarları tapmaq istəyirdi. Onlar bəzi bölgələrdə güclənərək müvəqqəti bazalar yaratmışdı. Lakin sonradan bu bazaların bir hissəsi gücləndirilib daimi məskunlaşma məntəqələrinə çevrilmişdi. *Vikinqlər* Böyük Britaniyada da məskunlaşmışdı. İngilis dilində bu gün mövcud olan bir sıra sözlər *vikinqlər*dən alınmışdır. Məsələn, "sky" (səma), "leg" (ayaq), "egg" (yumurta), "crawl" (sürünmək), "lift"(qaldırmaq) və "take" (götürmək) kimi sözlər şimal xalqlarının qədim dillərindən gəlir (Arakina, 1985).

Qədim ingilis dilində fransız dilindən bir çox söz götürülüb. Məsələn, "damage" (zərər), "prinson" (həbsxana) və "marriage"(evlilik) kimi sözlər ingilis dilinə fransız dilindən gəlib.

İngilis dilində qanunlar və hökumətə aid bir sıra sözlərə "jury" (jüri), "parliament" (parlament) və "justice"(ədalət, ədliyyə) kimi sözləri nümunə göstərmək olar (Cohen, 2008).

İngilis dili mütəxəssisləri Ceffri Çoseri ingilis dilində yazan ilk ən böyük şair adlandırır.

Onlar Çoserin "Kenterberri hekayələri"nin o dövr Britaniyada yaşayan insanların həyatının əsl mənzərəsini yarada bildiyini deyir. Əsas xüsusiyyəti həcmcə kiçikliyi, lakin mənaca hikmətli və nəsihətli olmasıdır. Atalar sözləri bitkin fikir ifadə edir, həm həqiqi, həm də məcazi mənada işlənir. Söz sənətimizin ilk örnəkləri qədim dövrlərdə yaranmış, dildən-dilə, ağızdan-ağıza keçərək yaşamış və zənginləşmişdir.

Şifahi xalq ədəbiyyatına folklor da deyilir. İngilis dilindən götürülmüş bu termin − folk xalq, lore isə bilik, hikmət (xalq müdrikliyi) anlamındadır. Folklor nümunələri xalq zəkasının qüdrətini, bədii təfəkkürünün gücünü parlaq əks etdirən, məzmun cəhətdən maraqlı, ideya baxımından zəngin, əsrlərin sınağından çıxmış əsərlərdir. Bu sənət inciləri janr əlvanlığı, dil-üslub aydınlığı, poetik tutumu və xəlqiliyi ilə seçilir. Şifahi ədəbiyyatda xalqın insan taleyi ilə bağlı düşüncələri, vətənpərvərliyi, humanizmi, sevgisi, nifrəti, müxtəlif tarixi dönəmlərdə üzləşdiyi mühüm ictimai-siyasi hadisələrə münasibəti geniş bədii əksini tapmışdır. Xalqın tarixi ilə sıx bağlı olan folklor onun öyrənilməsi üçün etibarlı mənbədir. Ümumilikdə fərdi folklor janrları üç növdə təsnif olunur. Maddi (incəsənət), şifahi, ümummilli dəyərlər (Musayev, 1996).

Fiziki obyektlər (avtoqraf kitablar, əl işi oyuncaqlar, daş heykəltəraşlıq, ağacdan əl işləri və s.) maddi folklor (ümumi deyimlər, atalar sözləri, mahnılar və s.), şifahi folklor (dini inanclar, milli rəqslər, bayramlar və s.) ümumilli dəyərlər folkloru kateqoriyasına daxildir. Xalqların şifahi poetik yaradıcıllığı ilk insan məskənlərinin yaranmasına gedib çatır. Atalar sözləri və deyimlər də öz növbəsində şifahi kollektiv folklor janrını təşkil edir. O zamanlardan bəri insanlar həyatları, yaşam

tərzləri və təbiət haqqındakı təcrübələri, bilik və sınaqları atalar sözlərində və deyimlərdə qısa bədii, məcazi şəkildə əks etdirmişlər. Zamanından, məkanından, etnik mənsubiyyətindən asılı olmayaraq, bütün dünya xalqlarının folklor yaradıcılığının ayrılmaz tərkib hissəsidir. Bir sözlə, dünyanın istisnasız olaraq heç bir xalqının etnokosmik düşüncə sistemini atalar sözlərindən qıraqda və ümumən atalar sözləri olmadan bir bütöv halında təsəvvür etmək mümkün deyildir. Bu xüsusiyyət atalar sözlərinin ümumən milli poetik düşüncənin, milli ictimai şüur və psixologiyanın mühüm struktur hadisəsi olduğunu göstərməklə yanaşı, ona münasibətdə biz keçmiş postsovet ölkələri alimlərinin baxışlarının da bütöv olmadığını ortaya qoyur. Atalar sözlərinin bütün janr mahiyyəti və ümumən semantik təbiəti folklora yalnız şifahi ədəbiyyat paradiqmasında yanaşmış sovet keçmişindən qalma ənənə olaraq bu gün də sırf bədii janr kimi tövsiyə olunur. Halbuki atalar sözlərinin sözlü folklor kimi bədii funksiyası onun milli mədəniyyət sistemində yerinə yetirdiyi funksiyanın yalnız formal tərəfini, qılafını, cildini, şəklini ifadə edir. Atalar sözləri və deyimlər istənilən etnik mədəniyyət tipində bütün zamanlar boyunca vahid və dəyişməz funksiya kimi kollektiv təcrübə və biliyin ötürülmə və yaşama vasitəsi olmaq vəzifəsini yerinə yetirmişdir. Bu müqəddəs kəlamlara tərif verməzdən əvvəl müxtəlif xalqların bu anlayış haqqında bəzi təsəvvürlərini sizə təqdim edək (Hall, Timofeeva, Kiricsi, Fox, 2010).

*Proverbs are the daughters of daily experience* (Atalar sözləri gündəlik təcrübələrimizin qızlarıdır) (Holland). *Proverbs are the salt in the language* (Atalar sözləri dilin duzudur) (ərəb). Görkəmli fransız yazıçısı A.Rivarol demişdir: *"Atalar sözləri bütün xalqların təcrübə və dünya görüşünün məhsulları, bütün əsrlərin düsturlara çevrilmiş sağlam mənasıdır"* (Vereshchagin, Kostomarov, 2005).

Atalar sözləri və məsəllər hələ sistemli şəkildə toplanana qədər çox qədim zamanlardan başlayaraq yazılı ədəbiyyatımızın görkəmli nümayəndələrinin diqqətini cəlb etmişdir. Nizami, Xəqani, Xətai, Füzuli və başqa sənətkarların əsərlərində bu və ya digər dərəcə külli miqdarda Azərbaycan atalar söz və məsəlləri işlətmişdir.

Eləcə də bir sıra yazıçılarımız öz əsərlərinin adlarını atalar sözlərindən götürmüşdür. Məsələn: Nəcəf bəy Vəzirovun "Arxadan atılan daş topuğa dəyər", "Sonrakı peşmançılıq fayda verməz", "Adı var, özü yox", "Yağışdan çıxdıq, yağmura düşdük", Ə.Haqverdiyevin "Yeyəsən qaz ətini, görərsən ləzzətini", Rəşid bəy Əfəndiyevin "Qonşu-qonşu olsa, kor qız ərə gedər" və s. deyimlər mənası və üslubi işlənmə səbəbiylə xüsusilə yadda qalan, qısa yazılmış söz və yaxud da ifadələrdir. Deyimlər aşağıdakı şəkildə siniflləndirilə bilər (Verdiyeva, 1977):

Aphorism – müdrikliyin özülü
Cliche – geniş yayılıb çox işlədilən ifadələr
Apothegm – qıcıqlandırıcı məzmun daşıyan ifadələr
Mantra – meditasiyalar, rituallar zamanı təkrarlanan ifadələr
Slogan – insanları bir şeyə inandırmaq məqsədi daşıyan ifadə
İdiom – mənası hər hansı bir hekayə, əfsanə ilə bağlı olan ifadə
Motto – bir qrup insan tərəfindən ümumi missiyanı özətləyən ifadə
Quip – yumoristik məna daşıyan ifadə

Atalar sözləri ümumi inancları ifadə edən və ya necə yaşamaq barədə məsləhətlər verən ümumi ifadələrdir. Atalar sözləri həyatda bir çox vəziyyətlərin öhdəsindən gəlmək üçün bizə tövsiyələr verə biləcək müdrik sözlərdir (Yespersen,1958).

Ən çox yayılmış ingilis atalar sözlərini bilmək faydalıdır, çünki onlar bəzən söhbətdə görünə bilər. Qeyri-anadillər idiomu tanımırlar, onlar onu hərfi mənada qəbul edə bilərlər, bu isə çox vaxt heç bir məna kəsb etmir. İdiomlardan fərqli olaraq, atalar sözləri hərfi mənada qəbul edildikdə məna kəsb edir, ancaq onları daha geniş vəziyyətlərə tətbiq etdikdə onların əsl mənası aydın olur. İnsanlar ingilis dilində atalar sözlərindən istifadə etdikdə çox vaxt atalar sözünün birinci hissəsini deyirlər. Atalar sözləri bir mədəniyyətin dünyaya baxış tərzi və bu mədəniyyətdən olan insanların inandıqları şeylər haqqında maraqlı fikirlər təqdim edə bilər. İngilis dili öyrənənlər bir neçə ingilis atalar sözünü yadda saxlamağı faydalı tapacaqlar ki, onları tanıya bilsinlər və həmçinin danışıqda daha çox doğma danışan kimi səslənsinlər (Seyid-zadə, 2006).

menarxedən dərhal sonra qızlarda endometrioz çox nadir haldır. Postmenopauzada olan qadınlarda da (hormonal preparatlar qəbul etməyənlərdə) endometrioz nadir hallarda müşahidə edilir (Sasagawa, Shimizu, Nagaoka, Dienogest, 2008: 31, 636-41).

Klinik təzahürlər − Endometriozun təzahürləri müxtəlifdir − asimptomatikdən dismenoreyaya, xroniki çanaq ağrılarına, disparuniyaya, menstrual disfunksiyaya, sonsuzluq və s. xəstələrin əksəriyyətinin əsas şikayəti ağrıdır.

Ağrı sindromu − cinsi əlaqə zamanı ağrı − menstrual funksiyanın pozulması − menstruasiyalar arası qanlı ifrazat − sonsuzluq.

Xəstəliyin əsas simptomu menatruasiyadan əvvəl güclənən və menstruasiyadan sonra zəifləyən güclü ağrıdır. Defekasiya zamanı (düz bağırsaq zədələndikdə) və sidiyə gedərkən (sidik kisəsi zədələndikdə) ağrı ola bilər. Bəzi pasiyentlər cinsi əlaqə zamanı ağrı və diskomfortdan şikayətlənirlər. Bu, sağrı-uşaqlıq bağları, rektovaqinal arakəsmələr, düz bağırsaq-uşaqlıq sahəsi və uşaqlıq yolu zədələnmələri olan qadınlarda rast gəlinir. Menstrual funksiyanın pozulması menstruasiyanın ağrılı, çox qan itirmə və uzun müddətli olmaqla dövriliyin pozulması ilə özünü büruzə verir. Menstruasiyadan əvvəl və bilavasitə sonra menstruasiyalar arası ifrazatın olması mümkündür.

Endometriozu olan qadınların təxminən yarısı sonsuzluqdan əziyyət çəkir. Sonsuzluğu yaradır: – ovulyasiya prosesinin pozulması – keyfiyyətsiz endometriya – kiçik çanaqda bitişmələrin yaranması – rostoqlandinlərin izafilliyi (yüksək olması) – ümumi və yerli immunitetin dəyişməsi.

Bu xəstəliyə uzun müddətli və proqressiv gediş xarakterdir. Xəstə nə qədər həkimə tez müraciət etsə, reproduktiv funksiyanın bərpa olunma şansı bir o qədər çoxdur.

**Endometriozun diaqnostikası.** Bu xəstəliyə diaqnoz qoyaraq müalicəni yalnız həkim təyin edə bilər. Özünü müalicə yolverilməzdir. Endometriozun digər ginekoloji xəstəliklərlə oxşar simptomlarına görə bəzi qadınlar dərmanlar qəbul edirlər ki, bu isə həm kömək etmir, həm sağlamlığa zərər vurur, eləcə də, xəstəliyin proqressivləşməsinə təkan verir (Fu, Osuga, Morimoto, 2008: 89, 1344-7). Yalnız mütəxəssis baxışı və müvafiq müayinələrdən sonra endometroz diaqnozunu qoya bilər.

Diaqnostika qayda üzrə anamnez toplamaqdan başlayır ki, anamnez və şikayətlər əsasında həkim sonrakı müayinələri təyin edir. *Diaqnostikaya daxildir:* ginekoloji baxış, transvaqinal datçikdən istifadə etməklə USM diaqnostika, histeroskopiya (diaqnostik qaşınma ilə), rentqenoloji müayinələr (histerosalpinqoqrafiya), kolposkopiya, laparoskopiya, qanın hormonal fona müayinəsi, endometrioz hüceyrələrə xarakter markerlərin aşkar olunması. Bu müayinələr endometriozun yayılma, xəstəliyin ağırlıq dərəcəsini müəyyənləşdirməyə imkan verir.

***Lokalizasiyalar***. Endometrioz daha çox aşağıdakı orqanlarda təsadüf edir − yumurtalıqlar, ön və arxa cul-de-sac (Duqlas boşluğu), arxa enli bağlarda (lig.latum uteri), uterosakral bağlarda, uşaqlıqda, uşaqlıq borularında, siqmavari bağırsaq və appendiksdə və uşaqlığın girdə bağı (lig.teres uteri). Daha az hallarda endometriozun təsadüf etdiyi sahələrə uşaqlıq yolu, uşaqlıq boyunu, rektovaginal septum, kor bağırsaq, qalça bağırsaq, qasıq kanalları, abdominal və ya perineumda olan çapıqlar, sidik kisəsi, sidik axarları və göbək aiddir (Shimizu, Mita, Takeuchi, 2011: 76, 60-7; Katayama, Katayama, Uematsu, 2010: 25, 2851-8). Nadir hallarda is endometrioz süd vəzi, mədəaltı vəz, qaraciyər, öd kisəsi, böyrək, sidik kanalı (uretra), ətraflar, onurğa, sümüklər, periferik sinirlər, ağciyərlər, dalaq, diafraqma və mərkəzi sinir sistemində də müşahidə edilə bilər. Əksər xəstələrdə endometrioz diaqnozu qoyulduqda xəstəlik bir neçə lokalizasiyalarda mövcud olur. Xəstəliyin kliniki mərhələsi endometrioz sahələrinin sayı və xəstəliyin ağırlıq dərəcəsi əsasında müəyyən edilir.




**Şəkil. Endometriozun ən çox təsadüf etdiyi lokalizasiyalar: çanaq, utero-rektal boşluq, utero-vesical sahə, yumurtalıqlar və abdominal divar**

Nadir hallarda endometriomalar abdominal divarda, adətən cərrahi kəsik yerləri ətrafında inkişaf edir. Bu cür lokalizasiyalarda endometriomaların əmələ gəlməsinin patogenezi adətən ya qan damarları, ya da limfatik damarlarla baş verən miqrasiya, hüceyrə metaplaziyası və yatrogen yayılma ilə əlaqələndirilir. Abdominal divar endometriozunda adətən xəstələr abdominal divarda ağrılı kütlədən şikayətlənir. Ağrı bəzən menstruasiya ilə əlaqələndirilir və ya davamlı da ola bilər. Qanaxmanın baş verməsi də mümkündür. Dəri altında inkişaf edən endometriomalar adətən qəhvəyi, mavi, qırmızı və ya qara rəngdə ola bilər. Abdominal divarın endometriomasına şübhə olduqda diaqnostika üçün US müayinəsi və ya MRT və ya KT görüntüləməsi istifadə edilə bilər. Bəzi hallarda (abdominal divarın yırtığı riski olmadıqda) kütlənin incə iynə aspirasiyası da aparıla bilər. Bütün hallarda abdominal divarda kütlə/törəmə müəyyən edildikdə differensial diaqnostikada yırtıq, hematoma, qranuloma, abses və törəmə də nəzərdən keçirilməlidir.

Xəstəliyin ilkin mərhələlərində, təcili cərrahi müdaxilə üçün mütləq əlamətlər olmadıqda, dərman müalicəsi ən azı 3 ay müddətində, adətən ağrıları azaltmaq üçün sınaq alternativ terapiya kimi başlana bilər. Dünyanın aparıcı ginekoloji icmalarının tövsiyələri bildirir ki, endometriozun diaqnozunu təsdiqləmək üçün menstrual qanaxmaların tezliyini azaltmağa yönəlmiş hormon terapiyasının aparılması arzuolunandır (Nakamura, Katsuki, Shibutani, Oikawa, 1999: 386, 33-40).

**Endometriozun müalicəsi**. Endometriozun müalicəsində dərman, cərrahi üsullar, eləcə də bu üsulların kombinasiyasından istifadə olunur. Erkən diaqnostika yalnız dərmanlarla müalicə olunmaqla cərrahi müdaxilədən qaçmağa imkan verir.

Endometriozun dərman müalicəsinə pasientin uzun müddət qəbul etdiyi hormonal preparatların təyini daxildir. Bunlar yumurtalıqların işini normallaşdırmaqla yeni ocaqların yaranmasının qarşısını alır (Köhler, Faustmann, Gerlinger, 21-5; Strowitzki, Faustmann, Gerlinger, Seitz, 2010: 151, 193-8; Cosson, Querleu, Donnez, 2002: 77, 684-92). Lakin bu üsul, xəstəliyin kistalar hələ yaranmamış ilkin mərhələsində effektlidir. Qeyd etmək lazımdır ki, retroservikal endometriozda hormonal terapiya effektsizdir. Bundan əlavə, onun tətbiqinə bir sıra əksgöstərişlər mövcuddur: − allerqiya; − şəkərli diabet; − qan və ürək-damar sistemi xəstəlikləri; − mədə-bağırsaq sistemi xəstəlikləri.

## Nəticə

Yumurtalığın endometrioid kistasını kəsib çıxarmaq və ya konservativ müalicə nəticə vermədikdə onun cərrahi yolla müalicəsi aparılır. Hazırda elektrokoaqulyasiya və ya lazerin köməyilə kiçik kəsikdən cərrahi əməliyyatı aparmağa imkan verən laparoskopiyaya əsaslanan üsul geniş tətbiq olunur. Belə müdaxilədən sonra menstrual tsiklin normallaşdırılması üçün dərman

müalicəsi və fizioterapiya kursu keçmək vacibdir. Xəstəliyin ağır formasında, əgər qadın daha uşaq dünyaya gətirməyi planlaşdırmırsa, uşaqlıq tam kəsilib çıxarılır.

Yüngül dərəcəli xəstəliklərdə qeyri-steroid iltihab əleyhinə dərman preparatları ilkin seçimdir. Kombinə olunmuş oral kontraseptiv preparatlar, həmçinin kontraseptiv vaginal halqalar və dəri plastırları yumurtalıq fəaliyyətini supressiya edir. Bu vasitələr tsiklik olaraq və ya 3-6 ay müddətində fasiləsiz (*continuously without a break* ) istifadə edilə bilər. Yalnız progestin tərkibli həblərin (mini həblər) və ya digər progestin (norethisterone 5-10 mq/gün, dienogest 2 mq/gün, medroxyprogesterone acetate 10-50 mq/gün, lynestrenol 5-10 mq/gün) preparatlarının fasiləsiz tətbiqi yumurtalığın aktivliyini supressiya edir. Levonorgestrel-ifraz edən uşaqlıq daxili vasitə (UDV) endometriumun, qismən də yumurtalıqların aktivliyini supressiya edir. QnRH-ın (qonadotropin-rilizinq hormonunun) aqonistləri menopauzaya müvafiq olan hipoestrogen bir mühit yaradırlar, lakin menopauza simptomlarının və osteoporozun qarşısının alınması üçün müalicəyə estrogen-progestin əvəzləyici və ya kombinə olunmuş oral kontraseptiv preparatları da əlavə olunur.

Yuxarıda qeyd edilən bütün hormonal müalicələr ağrının aradan qaldırılmasında eyni dərəcəli təsirə malikdir. Müalicə fərdi şəkildə seçilir və bununla əlavə təsirlərdən yayınmaq mümkün olur. Aromataza inhibitorları yumurtalıqdan kənar estrogen sintezinin qarşısını alır və cavan pasiyentlərdə oral kontraseptiv/progestin/QnRH aqonisti preparatları ilə birlikdə, həmçinin radikal cərrahi əməliyyatdan və ya menopauzadan sonra təklikdə də istifadə edilə bilər.

## Ədəbiyyat


1. Leyland, N., Casper, R., Laberge, Ph et al. (2010). Endometriosis: Diagnosis and Management. Clinical Practice Guideline. JOGC; 32 (7): 1-27.
2. Nnoaham, K.E., Hummelshoj, L., Webster, P et al. (2011). On behalf of the World Endometriosis Research Foundation Global Study of Women's Health consortium, 2011. Impact of endometriosis on quality of life and work productivity: a multicenter study across ten countries. Fertilityl Steril; 96 (2): 366-73.
3. BSP Women's Health Survey. (2009).
4. Rogers et al. (2010). Reprod Sci 2009; 16: 335-46. World Bank. Population Projection Tables by Country and Group.
5. Practice Committee of the American Society for Reproductive Medicine. (2008). Fertil Steril; 90: 260-9.
6. Abbott, J.A., Hawe, J., Clayton, R.D., Garry, R. (2003). The effects and effectiveness of laparoscopic excision of endometriosis: a prospective study with 2-5 year follow-up. Hum Reprod; 18: 1922-7.
7. Vercellini, P., Crosignani, P.G., Abbiati, A et al. (2009). The effect of surgery for symptomatic endometriosis: the other side of the story. Hum Reprod; 15: 177-88.
8. Shakiba, K., Bena, J.F., McGill, K.M., Minger, J., Falcone, T. (2008). Surgical treatment of endometriosis: a 7-year follow-up on the requirement for further surgery. Obstet Gynecol; 111: 1285-92.
9. Kennedy, S., Bergqvist, A., Chapron, C et al. (2005). ESHRE guideline for the diagnosis and treatment of endometriosis. Hum Reprod; 20: 2698-704.
10. Sasagawa, S., Shimizu, Y., Nagaoka, T et al. (2008). Dienogest, a selective progestin, reduces plasma estradiol levels through induction of granulosa cells in the ovarian dominant follicle without follicle-stimulating hormone in monkeys. J Endocrin Invest; 31: 636-41.
11. Fu, L., Osuga, Y., Morimoto, C et al. (2008). Dienogest inhibits BrdU uptake with G(0)/G(1) arrest in cultured endometriotic stromal cells. Fertil Steril; 89: 1344-7.
12. Shimizu, Y., Mita, S., Takeuchi, T et al. (2011). Dienogest, a synthetic progestin, inhibits prostaglandin E2 production and aromatase expression by human endometrial epithelial cells in a spheroid culture system. Steroids; 76: 60-7.

13. Katayama, H., Katayama, T., Uematsu, K et al. (2010). Effect of dienogest administration on angiogenesis and hemodynamics in a rat endometrial autograft model. Hum Reprod; 25: 2851-8.
14. Nakamura, M., Katsuki, Y., Shibutani, Y., Oikawa, T. (1999). Dienogest, a synthetic steroid, suppresses both embryonic and tumor-cell-induced angiogenesis. Eur J Pharmacol; 386: 33-40.
15. Köhler, G., Faustmann, T.A., Gerlinger, C et al. (2010). A dose-ranging study to determine the efficacy and safety of 1, 2 and 4 mg of dienogest daily for endometriosis. Int J Gynaecol Obstet; 108: 21-5.
16. Strowitzki, T., Faustmann, T., Gerlinger, C., Seitz, C. (2010). Dienogest in the treatment of endometriosis-associated pelvic pain: a 12-week, randomized, double-blind, placebo-controlled study. Eur J Obstet Gynecol Reprod Biol; 151: 193-8.
17. Cosson, M., Querleu, D., Donnez, J et al. (2002). Dienogest is as effective as triptorelin in the treatment of endometriosis after laparoscopic surgery: results of a prospective, multicenter, randomized study. Fertil Steril; 77: 684-92.

Göndərildi: 22.11.2022 Qəbul edildi: 02.02.2023

DOI: https://doi.org/10.36719/2663-4619/87/69-76

**Məlahət Hacıağa qızı Bağırova**
Azərbaycan Tibb Universiteti
bmelahet@gmail.com
**Gülnarə Aydın qızı Kərimova**
Azərbaycan Tibb Universiteti
gulnara948@ gmail.com
**Reyhan Rəhim qızı Bəylərova**
Azərbaycan Tibb Universiteti
reyhan.baylarova@ gmail.com
**Aytən Cəfər qızı Ağamalıyeva**
Azərbaycan Tibb Universiteti
agamaliyeva.ayten@gmaıl.com
**Nigar Valeh qızı Əliyeva**
38 saylı Şəhər Poliklinikası
dr.azer1989@maıl.ru

# UŞAQLARDA ROTAVİRUS İNFEKSİYASININ MÜXTƏLİF VARİANTLARININ KLİNİKİ-EPİDEMİOLOJİ XÜSUSİYYƏTLƏRİ VƏ MÜALİCƏ TAKTİKASI

**Xülasə**

Uşaq yaşlarında baş verən infeksion patologiyada virus diareyaları xüsusi əhəmiyyət kəsb edir. Hazırkı işdə uşaqlarda rotavirus infeksiyasının epidemioloji-kliniki xüsusiyyətləri və müalicəsi öyrənilib. Müəyyən olunub ki, virus etiologiyalı bağırsaq infeksiyaları 3 yaşa kimi baş verən infeksion qastroenteritlərin strukturunda əsas yerlərdən birini tutur. Virus diareyaları premorbid fonu qeyri-qənaətbəxş olan uşaqlarda daha ağır gedişli olur. 1 yaşa qədər hər bir uşaq həyat şəraitindən və sosial-iqtisadi statusundan asılı olmayaraq virus diareyasını keçirir və səhiyyə sisteminə böyük zərbə vurur. Virus diareyalarının əsas səbəblərindən biri rotaviruslardır. Hər il fatal nəticə verən RVİ-nin ağır formalarının sayının artması qeyd olunur.

***Açar sözlər:*** *uşaqlar, kəskin bağırsaq infeksiyaları, virus diareyaları, rotavirus infeksiyası, qastroenterit, müalicə*

**Malahat Hajiagha Baghirova**
Azerbaijan Medical University
bmelahet@gmail.com
**Gulnara Aydin Karimova**
Azerbaijan Medical University
gulnara948@ gmail.com
**Reyhan Rahim Baylarova**
Azerbaijan Medical University
reyhan.baylarova@gmail.com
**Aytan Jafar Aghamaliyeva**
Azerbaijan Medical University
agamaliyeva.ayten@gmaıl.com
**Nigar Valeh Aliyeva**
City polyclinic No. 38
dr.azer1989@maıl.ru

# Clinical-epidemiological features of various variants of rotavirus infection in children and treatment tactics

## Abstract

Viral diarrhea is of particular importance in infectious pathology occurring in children. In the present study, the clinical and epidemiological characteritics and treatment of various variants of rotavirus infection in children were studied. It has been established that intestinal infections of viral etiology occupy one of the main places in the structure of infectious qastroenteritis occurring up to 3 years of age. Viral diarrhea is more severe in children with unsatisfactory premorbid background. Every child under the age of 1, regardless of their living conditions and socio-economic status, suffers from viral diarrhea and has a great impact on the health care system. One of the main causes of viral diarrhea is rotavirus. Is should be noted that the number of severe forms of rotavirus infection with fatal results in increasing every year.

***Keywords:*** *children, acute intestinal infections, viral diarrhea, rotavirus infection, qastroenteritis, treatment*

## Giriş

Hal-hazırda praktik pediatriyanın ən mühüm problemlərindən biri kəskin bağırsaq infeksiyalarıdır (KBİ**)**. KBİ və ya ÜST-nin terminologiyasına görə “diareyalı xəstəliklər” həm inkişaf etmiş, həm də inkişaf etməkdə olan ölkələrdə özünün yüksək sosial-iqtisadi tibbi əhəmiyyətini saxlayır. Baxmayaraq ki, insanların həyat tərzinin gigiyenik şərtləri sürətlə yaxşılaşır, KBİ-nin səviyyəsi yüksək olaraq qalır. İl ərzində dünyada 500 milyon KBİ hadisəsi və 1,6 milyona yaxın ölüm hadisəsi qeyd olunur. Uşaqların xəstələnməsi və ölüm strukturunda KBİ III yeri tutur (Florez, Ni o-Serna, Beltr n-Arroyave, 2020: 1-12; Vasilyev, 2015; Mwenda, Ntoto, Abebe, 2020: 5-11).

Qida sənayesinin qloballaşdırılması, qida məhsulları, içməli suyun keyfiyyətinə və saxlanılmasına yüksək tələbat, pasterizasiya, konservləşdirmə texnologiyasından kütləvi istifadə və s. alimentar yolla ötürülən yoluxucu xəstəliklərin strukturunun əhəmiyyətli dərəcədə dəyişilməsinə səbəb olub. Həmçinin XX əsrdə təbabətdə əldə olunan nailiyyətlər: antibakterial terapiyanın təkmilləşdirilməsi, yeni yüksək həssas və spesifik laborator diaqnostika üsullarının tətbiqi KBİ-nin etiologiyasını identifikasiya etməyə imkan verir. Belə ki, XX əsrin I yarısında bakterial infeksiyalar üstünlük təşkil etdiyi halda, son illərdə virus infeksiyaları dominantlıq edir və “ekoloji yoxsulluğu” sürətlə doldurur, hansı ki onların törədiciləri ötürülmə yollarına bir o qədər tələbkar deyil və müxtəlif yoluxma yolları ilə reallaşır (Briko, Pokrovskiy, Malyshev, 2015: 20-28; Baranov, 2017: 248).

Statistik məlumatlar göstərir ki, diareyaların 40-70%-ni viruslar törədir, ilin soyuq aylarında bu göstəricilər daha da artır. Erkən yaşlı uşaqlarda KBİ-nin strukturunda rotavirus diareyaları xüsusi yer tutur. Virus diareyalarının sürətlə yayılması, kəskin başlaması, eksikozun sürətli inkişafı, infeksion agentin ətraf mühitdə davamlılığı, infeksiyanın çoxlu sayda simptomsuz gəzdiricilərinin olması, kliniki xüsusiyyətləri xəstəliklərin bu qrupuna xüsusi diqqət ayırmağı tələb edir (Ploskireva, 2017: 5-10; Sergevnin, 2020: 14-19).

Müasir dövrdə rotavirus infeksiyası (RVİ) bütün ölkələrdə əhalinin sağlamlığında ciddi rol oynayan infeksiyalardan biridir. Son 10 ildə bu xəstəliyin rastgəlmə tezliyinin sürətlə artması qeyd olunur, belə ki, hər 100 min əhaliyə 70-72 xəstələnmə hadisəsi qeyd olunur. RVİ ilə yer üzündə hər il orta hesabla 125 milyon uşaq xəstələnir ki, onların da 2,5 milyonu hospitalizasiya olunur. Hər il rotavirus (RV) diareyasından təxminən 500 min uşaq ölür. Ekspertlərin verdiyi məlumata görə cəmiyyətin həyat tərzindən və sivilizasiyasından asılı olmayaraq bütün dünyada 5 yaşa qədər uşaqların bu infeksiyaya həssaslığı, ümumi xəstələnməsi eynidir. Fərq ondan ibarətdir ki, inkişaf etməkdə olan ölkələrdə RVİ-dən baş verən ölümün səviyyəsi inkişaf etmiş ölkələrə nisbətən yüksəkdir (Zuccoti, 2010: 218; Deribew, 2016: 1-10).

RVİ xəstəxanadaxili diareyaların da əsas səbəblərindən biri olub, müxtəlif mövsümlərdə 31%-dən 87%-ə kimi təşkil edir. İnkişaf etməkdə olan ölkələrdə uşaqların ¾-də həyatın I ilində, inkişaf etmiş ölkələrdə isə bir qədər gec RVİ-nin I epizodu baş verir. Xəstəliyin ağırlıq dərəcəsi I növbədə susuzlaşma ilə əlaqədar olur və ağır dərəcəli susuzlaşma, əsasən həyatın 6-24 ayı arasında olan uşaqlarda baş verir. Bu da onların 65-85%-nin hospitalizasiyasına səbəb olur (Giagwinto, 2020: 142-147).

I yoluxmadan sonra seroloji cavab virusun spesifik serotipinə qarşı yaranır, o da davamsız olur, sonrakı yoluxmalarda daha geniş heterotrop immun cavab yaranır. Çarpaz təsir göstərən antitellər virusun digər variantlarını neytrallaşdırır, bu da təkrar yoluxmada xəstəliyin tezliyini və ağırlığını aşağı salır (Lyakhovskaya, 2013).

İnfeksiya mənbəyi xəstə adamlar və virusgəzdiricilərdir, yoluxma fekal-oral yolla baş verir. Rotaviruslar ətraf mühitə nəcislə xaric olur. Nəcisdə viruslar kliniki simptomlar ilə bir vaxtda meydana çıxır, onun da ən yüksək konsentrasiyası xəstəliyin birinci 3-5 günündə qeyd olunur və bu dövrdə çox böyük epidemioloji təhlükə təşkil edir. Nəcis normallaşdıqca virusların da miqdarı azalır, 70% uşaqlarda virusların ekskressiyası xəstəliyin hər hansı simptomları olmadıqda 20 günə qədər davam edir. Ləng gedişli olduqda virus hətta 66-120 günə qədər ifraz oluna bilər. RVİ-nin yüksək kontagiozluğunu və məişət kimyəvi vasitələrinə davamlılığını nəzərə alsaq, hətta gigiyenik qaydalara ciddi əməl etdikdə belə yoluxma hadisəsi baş verə bilər.

RVİ kəskin mövsümüliyə malikdir. O, bütün il ərzində qeydə alınır, lakin 80%-dən çox hadisələr ilin soyuq aylarında − dekabrdan marta qədər aşkar edilir. Qış-yaz mövsümüliyi rotavirusların ətraf mühitdə aşağı temperaturda həyat qabiliyyətini daha yaxşı saxlaması ilə əlaqədardır, hətta dəfələrlə dondurulma virusu məhv edə bilmir. Xəstəlik tək-tək hadisələr və epidemik alovlanmalarla təzahür edir (Feklisova, 2016).

RVİ-nin risk faktorları: sosial məişət durumunun aşağı olması, kiçik yaşlı uşaqlar, süni qidalanma, keyfiyyətsiz qidalanma, yarımçıq doğulma, immunodefisit vəziyyət, digər orqan və sistemlərin xəstəlikləridir. 95% uşaqlar rotavirus qastroenteritini həyatının ilk 5 yaşında keçirirlər. 1 yaşa qədər uşaqlar çox vaxt infeksiyalaşmış analardan, daha böyük yaşdakı uşaqlar isə mütəşəkkil uşaq kollektivində yoluxurlar. Daha ağır kliniki təzahürlər ən çox körpələrdə 6 aylığından 2-3 yaşa kimi nəzərə çarpır. Bunun da səbəbi odur ki, ilk yarım ildən sonra uşaq qarışıq qidalanmaya keçir, bu da infeksiyanın məişət-təmas yolu ilə ötürülməsini artırır. 0-6 ay arasında olan südəmər uşaqlar müəyyən dərəcədə bu xəstəlikdən "sığortalanırlar", belə ki, anadan aldıqları immunoqlobulinlər virusun orqanizmə daxil olmasına mane olur.

*Tədqiqatın məqsədi* erkən yaşlı və məktəbəqədər yaş dövründə olan uşaqlarda RVİ-nin yaşdan asılı olaraq xəstəliyin müxtəlif variantlarının gedişinin xüsusiyyətlərini və müalicəsini öyrənməkdir.

**Tədqiqatın material və metodları**. 6 ayla 7 yaş arasında RVİ-sı olan 60 uşaq kliniki, laborator müayinə olunub. Müayinə Loğmed klinikasında və Ə.Qarayev adına 2 saylı BKUX-nin yoluxucu şöbəsində aparılıb. Bunların 38 nəfəri qız, 22 nəfəri isə oğlan olub. Xəstələrin heç biri rotavirus əleyhinə vaksin almayıb. Onların hamısında ümumi analizlər, nəcisin bakterioloji müayinəsi, İFA-test sistemlə (on Site Rapid Test) müayinəsi aparılıb. Onlardan 39-u 6 ayla 3 yaş arasında, 21-i isə 3-7 yaş arasında olub və hamısında A qrupundan olan rotaviruslar aşkar olunub. Uşaqların 40-da monovariant RVİ (nəcisdə ancaq RV antigeni tapılıb), 20-də isə mikstvariant RVİ (nəcisdə RV və mikroflora tapılıb) diaqnozu qoyulub. Monovariant RVİ-da orta yaş 20,4± 10,2 ay, mikstvariant RVİ-da isə orta yaş 3,6±17,8 ay təşkil edib. Miksvariant RVİ-da nəcisin bakterioloji müayinəsində əsas Klebsiella, Pneumonia, Pseudomonas aeruginoza, Sitrobakter, Enterobacter Cloacae, Proteus vulqaris, Proteus mirablis aşkar olunub.

**Cədvəl 1.**
**Müxtəlif yaş qrupunda olan uşaqlarda RVİ-nin gedişinin xüsusiyyətləri**

| | Simptomlar | 6 ay-2 yaş | 2-7 yaş |
|---|---|---|---|
| | İntoksikasiya simptomları | Çox kəskin olur, 2-4 gün davam edir. | Yüngül və ya orta dərəcədə olur, davametmə müddəti 1,5-2 gün olur. |
| | Qusma | Bədən hərarəti yüksələndə ilk gündə qusma meydana çıxır, sutkada 3 dəfədən 5-7-yə kimi olur. Qusma adətən II gün kəsilir, bəzi hallarda qusmaya çağırış hələ 2 gün də davam edir. | Xəstəliyin I günü bədən hərarətinin yüksəlməsi ilə bir vaxtda meydana çıxır, adətən 1-2 dəfə olur. |
| | Diareya | Xəstəliyin I günü başlayır. Defakasiyaya çağırış qəfil, qeyri iradi xarakter daşıyır. Nəcis ifrazatının sayı sutkada 10-15 dəfə olur, ağır formalarda 25 dəfədən çox olur. Adətən 3-4 günə sönür, ağır halda 5-6 gün davam edir. | Nəcis ifrazının sayı sutkada 2-3 dəfə, maksimum 5 dəfədən çox olmur. Nəcis açıq qəhvəyi rəngdə, sıyığabənzər, həcmli, kəskin qoxulu, bir qədər köpüklü olur. Diareya 2-3 günə sönür. |
| | Qarında ağrı | Adətən 2 yaşa qədər uşaqlar yaxşı danışa bilmədikləri üçün sözlə ağrını ifadə edə bilmirlər. Ağrı vaxtı qarınlarını tutur, çox vaxt oturur və ya bükülürlər. | Uşaqlar qarında olan ağrıdan şikayət edirlər. Ağrılar zəif və ya orta intensivlikdə çox vaxt göbək ətrafında olur, nisbətən iri yaşlı uşaqlarda yayılmış xarakter daşıyır. |
| | Meteorizm | Köp, qurultu olur. | Yüngül köp, periodik qurultu olur. |
| | Sağalma | Tam sağalma 6-8 gündən sonra baş verir. | Sağalma 4-5-ci gündən baş verir. |

**Cədvəl 2.** (p< 0,05)
**Vezikarinin bal sistemli şkalasına görə mono və mikstvariant RVİ olan xəstələrdə simptomların davametmə müddəti**

| Kliniki göstəricilər | Monovariant RVİ olan uşaqlar (%-lə) | Mikstvariant RVİ olan uşaqlar (%) |
|---|---|---|
| Diareyanın davametmə müddəti, günlə | | |
| 1-4 gün<br>5 gün<br>> 5 gün | 46,6<br>44,2<br>9,2 | -<br>82,1<br>17,9 |
| Ən çox qusma sayı olan müddət, günlə | | |
| Olmur<br>1 gün<br>2-4 gün<br>> 4 gün | 15,2<br>45,3<br>28,3<br>12,2 | 10,3<br>25,2<br>32,1<br>32,4 |

| Kliniki göstəricilər | Monovariant RVİ olan uşaqlar (%-lə) | Mikstvariant RVİ olan uşaqlar (%) |
|---|---|---|
| Hipertermiya | | |
| <37,0<br>37,1-38,1<br>38,1-38,9<br>>38,9 | 5,1<br>33,6<br>38,2<br>28,1 | -<br>21,1<br>64,3<br>14,6 |
| Dehidratasiya | | |
| Olmur<br>1-5 %<br>> 5% | 40,2<br>50,3<br>9,5 | 29,2<br>60,6<br>10,2 |

**Cədvəl 3.**
**Vezikari şkalası ilə kəskin qastroenteritlərin ağırlıq dərəcəsinin qiymətləndirilməsi (günlə)**

| Xəstəliyin ağırlıq göstəriciləri | Xəstəliyin əlamətlərinin kəskinlik dərəcəsi | | |
|---|---|---|---|
| | 1 bal | 2 bal | 3 bal |
| Diareyanın davametmə müddəti (günlər) | 1-4 | 5 | ≥ 6 |
| Defekasıyanın maksimal sayı / 24 s | 1-3 | 4-5 | ≥ 6 |
| Qusma epizodlarının maksimal sayı / 24 s | 1-3 | 4-6 | ≥ 7 |
| Qusmanın saxlanılma müddəti (günlə) | 1 | 2 | 3 |
| Bədən temperaturunun yüksəlməsi (ºC) | 37,1-38,4 | 38,5-38,9 | ≥ 39,0 ºC |
| Dehidratasiya | Olmur | Orta | Orta-agır |
| Müalicə | Rehidratasiya | Hospitalizasiya | - |

Kəskin qastroenteritlərin yüngül dərəcəsi 0-8 bal, orta ağır dərəcəsi 9-11 bal, ağır dərəcəsi >11 balla qiymətləndirilir.

Vezikarinin bal sistemli şkalasına görə monovariant RVİ-ni keçirən xəstələrdə xəstəliyin ağırlıq dərəcəsi orta 9,1 bal, mikstvariant RVİ olan xəstələrdə isə 10,2 balla qiymətləndirilib.

**Cədvəl 4. ($p< 0,005$)**
**Rekonvalessensiya dövründə mono və mikstvariant RVİ olan xəstələrin şikayətlərinin müqayisəli xarakteristikası**

| RVİ keçirən uşaqların şikayətləri (%) | Dispanser nəzarətinin müddəti | | | | | |
|---|---|---|---|---|---|---|
| | 1 ay | | 2 ay | | 3 ay | |
| | Monovariat RVİ | Mikstvariant RVİ | Monovariant RVİ | Mikstvariant RVİ | Monovariant RVİ | Mikstvariant RVİ |

| RVİ keçirən uşaqların şikayətləri (%) | Dispanser nəzarətinin müddəti | | | | | |
|---|---|---|---|---|---|---|
| İştaha pozğunluğu | 28,2 | 78,7 | 7,6 | 68,8 | - | 42,2 |
| Ürəkbulanma | 25,8 | 52,8 | 12,5 | 26,6 | 12,5 | 10,7 |
| Qusma | 2,5 | 10,6 | 2,4 | 2,9 | - | - |
| Meteorizm | 87,1 | 89,7 | 28,2 | 30,4 | - | 8,7 |
| Abdominal ağrı | 38,2 | 73,8 | 15,3 | 31,6 | 2,5 | 21,6 |
| Bağırsaq disfunksiyası | 58,6 | 93,5 | 38,6 | 84,4 | 5,3 | 36,9 |

Monovariant RVİ və mikstvariant RVİ-ni keçirən uşaqların şikayətlərinin müqayisəli xarakteristikası göstərir ki, rekonvalessensiya dövründə aparılan kliniki müşahidənin 1 ayında monovariant RVİ keçirən uşaqların şikayətləri azalır, 2 ayında az da olsa qalır, 3 ayında isə bağırsağın funksiyası tam bərpa olunur (< 0,05). Mikstvariant RVİ-ni keçirən uşaqların əksəriyyətinin şikayətləri kliniki müşahidənin 1 ayında saxlanılır, 2 ayında azalır, 3 ayında isə bəzi şikayətləri keçsə də, qeyri sabit xarakterli nəcis ifrazı 3 ayında hələ saxlanılır. Katamnestik məlumatlar göstərir ki, əksər uşaqlarda baırsağın funksiyası 4 ayında tam bərpa olunur ($p < 0,005$). Yuxarıda deyilənlərdən aydın olur ki, monovariant RVİ-ni keçirən uşaqlar 3 ay, mikstvariant RVİ-ni keçirənlər isə 4 ay müddətində dispanser qeydiyyatında olmalı və vaxtaşırı müayinə olunmalıdırlar.

Monovariant RVİ və mikstvariant RVİ-si olan bütün xəstələrə xəstəliyin ağırlıq dərəcəsinə uyğun olaraq BST-nin qəbul etdiyi təlimata görə ümumi qəbul olunmuş bazis terapiya (pəhriz, rehidratasiya, fermentativ müalicə, eubiotik, simptomatik müalicə) aparılıb. Təbii qidalanan uşaqlarda ana südü saxlanılıb, süni qidalanan uşaqlarda isə kəskin dövrdə laktozasız qidalar verilib. Böyük yaşlı uşaqlarda südlü, karbohidratlı, bağırsaq peristaltikasını artıran qidalar (təzə meyvələr, çiy tərəvəzlər, meyvə şirələri) rasiondan çıxarılıb.

Əsas müalicə prinsipi itirilən mayenin bərpası və susuzlaşmanın qarşısının alınmasıdır. Yüngül və orta ağır forma RVİ-də maye itkisi daxilə qəbul etməklə bərpa oluna bilər. Bu məqsədlə duz məhlullarından (rehidron, rehidralit, pedialit) istifadə olunub. Hər nəcis ifrazından və ya qusmadan sonra 50 ml /saat hesabı ilə maye daxilə qəbul olunmalıdır. Vəziyyət yaxşılaşdıqca mayenın miqdarı azaldılır. Duru nəcis ifrazı gündə 2-3 dəfə olduqda sutkada 1 litr maye qəbul edilməlidir. Ağır formada isə venadaxili infuziya təyin olunur (kolloid və kristalloid məhlullar).

Bağırsaqdan toksinləri xaric etmək üçün adsorbentlər (atoxil plus, carbovayt, smekta, enterosgel) təyin olunur.

Mikstvariant RVİ-da xəstəliyin gedişi nisbətən ağır, fəsadlı olduğuna görə antibakterial maddələr, əsasən yerli təsirli antibiotik olan nifurroksazid tərkibli dərmanlar (enterofuril) və intestibakterofaq təyin olunur.

Yüksək hərarət olduqda parasetamol, nurofen, ağrı sindromunda isə spazmolitiklər (spaskupreel, papaverin) vermək olar.

RVİ-nin yüksək kontagiozluğunu, qeyri spesifik profilaktika tədbirlərinin kifayət qədər effektiv olmamasını, etiotrop müalicənin olmamasını nəzərə alsaq, müasir dövrdə bu infeksiyaya nəzarətdə vaksinoterapiya yüksək keyfiyyətli metod sayılır. BST RV əleyhinə vaksinasiyanı bütün dünya ölkələrinin milli immunizasiya proqramına salınmasını tövsiyə edir. Vaksinasiya geniş əhali

kütləsini əhatə etməlidir, ancaq bu yolla infeksion prosesə nəzarət etmək olar. Postvaksinal immunitet davamlı, ömürlük olur, nadir halda preparatın tərkibinə daxil olmayan ştam tərəfindən yüngül formada xəstəlik baş verə bilər, kəskin toksikoz və susuzlaşma əlamətləri olmur, proqnozu xoşdur.

## Nəticə

1) İri yaşlı uşaqlarla müqayisədə 3 yaşa qədər uşaqlarda RVİ zamanı qusma və nəcis ifrazının sayı nisbətən çox və davamlı olur.

2) 3 yaşa qədər uşaqlarda iri yaşlı uşaqlardan fərqli olaraq su-duz mübadiləsi tam formalaşmadığına görə onlarda susuzlaşma daha erkən baş verir.

3) 3 yaşa qədər uşaqların əksəriyyətində onların orqanizmi anatomik, morfoloji, funksional cəhətdən yetkin olmadıqlarına görə II-li bakterial infeksiyanın qoşulması, mikstvariant RVİ-nin baş verməsi, daha ağır gedişli, fəsadlı olması xarakterikdir.

4) Monovariant RVİ və misktvariant RVİ keçirən xəstələrin əsas şikayətlərinin müqayisəli xarakteristikası göstərir ki, I qrupa daxil olan uşaqlarda kliniki müşahidənin 1 ayında əsas şikayətləri azalır, 2 ayında az da olsa qalır, 3 ayında isə bağırsağın funksiyası tam bərpa olunur. II qrupun uşaqarında isə əsas şikayətlər kliniki müşahidənin 1 ayında saxlanılır, 2 ayında azalır, 3 ayında isə bəzi şikayətləri keçsə də, qeyri sabit xarakterli nəcis ifrazı saxlanılır.

5) Monovariant RVİ-ni keçirən uşaqlar 3 ay, mikstvariant RVİ -ni keçirənlər isə 4 ay müddətində dispanser qeydiyyatda olmalı və vaxtaşırı kliniki, laborator müayinə olunmalıdır.

6) RVİ-də əsas müalicə taktikası susuzlaşmanın qarşısının alınması və su-duz mübadiləsinin bərpa olunmasından ibarətdir. Bakterial infeksiya qoşulan mikstvariant RVİ-də isə baş verə bilən fəsadların qarşısının alınması üçün bakteriofaqın və antibakterial müalicənin qoşulması göstərişdir.

8) RVİ-nin yüksək kontagiozluğunu və məişət kimyəvi vasitələrinə davamlılığını nəzərə alsaq, hətta ciddi gigiyenik qaydalara əməl etdikdə belə yoluxma baş verə bildiyinə görə spesifik profilaktikanın − vaksinoterapiyasının aparılması məsləhətdir.

## Ədəbiyyat

1. Florez, I.D., Ni o-Serna, L.F., Beltr n-Arroyave, C.P. (2020). Acute infectious diarrhea and qastroenteritidis in children. Current infectious disease reports. T.22, № 2, p.1-12.
2. Vasilyev, K.G. (2015). Osobennosti epidemicheskogo protsessa rotavirusnoy infektsii v Odesskoy oblasti. Epidemiologiya i infektsionnyye bolezni. E.20, № 4.
3. Mwenda, J.M., Ntoto, K.M., Abebe, A. et al. (2020). Burgen of epidemiolojy of rotavirus diarrhea in selected African countries: preliminary result from the African Rotavirus Surveliance. J.Infect.Dis., Vol. 202 (suppl), p.5-11. https: doi.org/ 10.1086 / 653557 Pmid:2068471
4. Briko, N.I., Pokrovskiy, I., Malyshev, N.F. (2015). Globalizatsiya i rasprostraneniye infektsionnykh zabolevaniy. Prikladnaya mikrobiologiya, t.2, № 1 (4), s.20-28.
5. Baranov, A.A. i dr. (2017). Rotavirusnaya infektsiya u detey nereshennaya problema. Pediatricheskaya farmakologiya, t.14, № 4, s.248-257.
6. Ploskireva, A.A. (2017). Rotavirusnaya infektsiya u detey, epidemiologicheskiye i klinicheskiye aspekty na sovremennom etape. Epidemiologiya i infektsionnyye bolezni. Aktualnyye voprosy, № 6, s.5-10.
7. Sergevnin, V.I. (2020). Sovremennyye tendentsii v mnogoletney dinamike zabolevayemosti ostrymi kishechnymi infektsiyami bakterialnoy i virusnoy etiologii. Epidemiologiya i vaktsinoprofilaktika, t.19, № 4, s.14-19.
8. Zuccoti, G. (2010). Epidemiological and clinical features of rotavirus among children younger than 5 years of age hospitalized with acute gastroenteritis in Northern Italy. BMC infect. Dis., Vol. 22; 10, p.218.
9. Deribew, A. et al. (2016). Trends, causes, and risk factors of mortality among children under 5 in Ethopia, 1990-2013: findings from the Global Burden of Disease study 2013. Population health metrics, t.14, № 11, p.1-10.

10. Giagwinto, C. (2020). Age distributrion of pediatric rotavirus qastroenteritis cases in Europe: the REVEAL study. Scand. J. Infect. Dis., Vol. 42, № 2, p.142-147.
11. Lyakhovskaya, N.V. i dr. (2013). Rotavirusnaya: Epidemiologicheskiye aspekty, metody profilaktiki, immunologiya, allergologiya, infektologiya. Moskva, № 3.
12. Feklisova, L.B. (2016). Ekskretsiya rotavirusov v fekalikh patsiyentov pediatricheskikh statsionarov v techeniye goda. Vrach., № 10, s.77-82.

**Rəyçi: t.ü.f.d. Zərqələm Ömərova**

Göndərildi: 12.11.2022 Qəbul edildi: 25.01.2023

DOI: https://doi.org/10.36719/2663-4619/87/77-82

**Pərvanə Nizami qızı Bağırova**
Elmi-Tədqiqat Mamalıq və Ginekologiya İnstitutu
dr.parvana@mail.ru

# VAGİNİTLİ XƏSTƏLƏRİN OPTİMAL MÜALİCƏSİNİN HƏYAT KEYFİYYƏTİNƏ TƏSİRİNİN MÜQAYİSƏLİ XARAKTERİSTİKASI

**Xülasə**

Tədqiqatın məqsədi ənənəvi müalicəsi və 30%-li karbamid ilə müalicə alan vaginitli xəstələrin həyat keyfiyyətinin müqayisəli aspektdə təhlilindın ibarət olmuşdur. Tədqiqat işi Elmi-Tədqiqat Mamalıq-Ginekologiya İnstitutunun bazasında aparılmışdır. Tədqiqata vaginit diaqnostikası təyin edilmiş 120 qadın daxil edilmişdir. Qadınlar tətbiq edilən müalicə sxeminə görə iki qrupa ayrılmışlar. Hər iki qrupa 60 xəstə daxil edilmişdir. Nəzarət qrupu xəstələrə qeyd edilən patoloji proseslərə görə standart iki mərhələli müalicə tətbiq edilmişdir, əsas qrupa 30% karbamidlə müalicə sxemi təyin edilmişdir. karbamidlə müalicədən sonra nəzarət qrupu ilə müqayisədə klinik pozuntuların tezliyi dürüst azalmışdır. VSQ sorğusu və Vaginal simptomların intensivliyinin 5 ballıq şkala üzrə (D.Barlow) xəstələrin həyat keyfiyyətinin yaxşılaşması müşahidə edilmişdir. Müalicədən sonra tədqiq edilən qrupların hər birində xəstələrin həyat keyfiyyəti ümumiyyətlə yaxşılaşmışdır. Bununla belə, ənənəvi müalicə qrupunda "həyata qabiliyyəti" göstəricisində əhəmiyyətli dəyişikliklər baş vermədiyi halda, 3%-li karbamidlə müalicə qrupunda statistik əhəmiyyətli müsbət tendensiya müşahidə edilmişdir. Bununla yanaşı, ənənəvi iki mərhələli müalicə qrupunda cüzi sayda mənfi hadisələr aşağı tezliklə də olsa, qeydə alınmışdır.

***Açar sözlər:*** *vaginitlər, müalicə, karbamid, həyat keyfiyyəti, VSQ sorğusu, simptomların intensivliyi şkalası*

**Parvana Nizami Baghirova**
Scientific Research Institute of Obstetrics and Gynecology
dr.parvana@mail.ru

# Comparative characterization of the effect of optimal treatment on the quality of life of patients with vaginitis

**Abstract**

The aim of the study was to analyze the quality of life of patients with vaginitis who received traditional treatment and treatment with 30% urea in a comparative aspect. The research work was carried out on the basis of the Scientific-Research Institute of Obstetrics and Gynecology. 120 women diagnosed with vaginitis were included in the study. Women were divided into two groups according to the applied treatment scheme. 60 patients were included in both groups. Standard 2-stage treatment was applied to the control group of patients according to the mentioned pathological processes, the main group was assigned a treatment scheme with 30% urea. After treatment with urea, the frequency of clinical disorders was significantly reduced compared to the control group. Improvement of patients' quality of life was observed according to VSQ survey and 5-point scale of intensity of vaginal symptoms (D.Barlow). After treatment, patients' quality of life generally improved in each of the studied groups. However, while there were no significant changes in "viability" in the conventional treatment group, a statistically significant positive trend was observed in the 3% urea treatment group. However, a small number of adverse events were recorded in the conventional two-stage treatment group, albeit at a low frequency.

***Keywords:*** *vaginitis, treatment, urea, quality of life, VSQ questionnaire, symptom intensity scale*

## Giriş

Aşağı cinsiyyət yollarının infeksion-iltihabi xəstəlikləri ginekoloji patologiyanın strukturunda əsas mövqe tutan xəstəliklərdən biri olaraq qalmaqdadır. Eyni zamanda vulvovaginal infeksiyalar arasında qeyri-spesifik vaginit daha çox mütləq patogenlər nəticəsində baş verir, 76-80%-ə çatır (Zharkin, Lemyakina, Burova, 2012: 35-39).

Qeyri-spesifik vulvovaginitin residivlərin gedişatı bir sıra fəsadlara yol açır, bunlar arasında sonsuzluq, aybaşı pozuntuları, potensial onkogen virusların təsiri riski, genital traktın yuxarı nahiyəsində infeksiyanın artması, kiçik çanaq orqanlarında əməliyyatdan sonra infeksion ağırlaşmaların inkişafı, cinsi yolla yoluxma ehtimalı, uşaqlıq boynunda morfoloji dəyişikliklərin əmələ gəlməsini göstərmək olar (Sobel, 2016: 15-21; Lebedev, Pashkov, 2011: 12-16).

BV polimikrob xəstəlik olub, daha çox G vaginalis ştammına yoluxma ilə xarakterizə olunur (Pendharkar, Brandsborg, Hammarström, Marcotte, Larsson, 2015: 15; Hard, Jespers, Van den Bulck, 2017).

Vaginitlərin müalicəsinin standart sxemi iki mərhələldən ibarət olub. Birinci (hazırlıq) mərhələnin məqsədi uşaqlıq yolu mühitin optimal biokimyəvi və biofiziki şəraitini yaratmaq və BV ilə əlaqəli mikroorqanizmləri məhv etmək idi. Bunun üçün aşağıdakılar istifadə olunur:
1) antibiotiklər (klindamisin, linkomisin, xloramfenikol); 2) 5-nitroimidazollar (metronidazol, tinidazol, ornidazol); 3) kombinə edilmiş preparatlar; 4) yerli antiseptiklər; 5) turşu preparatları (laktik turşu, bor turşusu). İkinci mərhələnin mahiyyəti həyat qabiliyyətli laktik turşu bakteriyaları (əsasən laktobakteriyalar) olan probiotiklərin transplantasiyası yolu ilə uşaqlıq yolunun normal mikrobiosenozunu saxlamaq və ya bərpa etməkdən ibarətdir (Kira, Rastorgueva, Khalturina, Pushkina, 2020: 201-208).

Karbamid bir çox birləşmələrlə klaratlar şəklində komplekslər yaradır, məsələn, hidrogen peroksid ilə CO(NH2)2-H2O2 yaradır ki, bu da istifadədə rahat və təhlükəsiz "quru" hidrogen peroksid formasıdır (Gidroperit). Hidroskopik xüsusiyyətə malik olduğuna görə buynuz qişada əlavə mayeni bağlayaraq yaraların sağalmasına, iltihabın azalmasına və dezinfeksiyaya kömək olur. Böyük konsentrasiyalarda aşındırıcı təsir göstərir. Bədən toxumalarında normada da karbamid olduğuna görə allergik reaksiya olma ehtimalı minimallaşır. Karbamidin bu xüsusiyyətlərini nəzərə alaraq tərəfimizdən qeyri-spesifik vaginitli xəstələrə yerli sanasiyası tətbiq edilmişdir (Shipidchenko, Kulygina, Isak, 2016: 23-27).

Aparılan tədqiqatlardan məlum olmuşdur ki, bakterial vaginitlər qadınların həyat keyfiyyətinə mənfi göstərir. Göstərilmişdir ki, vagintilərin simptomları qadınlarda həyəcan şəraitində yaşamasına səbəb olur (Bilardi, Walker, 2013; Bagnall, Rizzolo, 2017).

Adolsfon A. tərəfindən aparılan tədqiqatda məlum olmuşdur ki, xəstəliyin düzgün müalicəsi mütləq şəkildə qadınların həyat keyfiyyətinə müsbət təsir götərir (Kaambo, 2017: 108-118; Adolfsson, Hagander, Mahjoubipour, 2017). Xüsusilə pis qoxulu ifrazat qadınlarda diskomfort yaradaraq, onlara dərin stress yaşadır (Allsworth, Peipert, 2004, 2017: 114-120).

Biz də vaginitlərin qadınların həyat keyfiyyətinə dərin mənfi təsir göstərdiyini nəzərə alaraq, təklif etdiyimiz müalicə və ənənəvi müalicə tədbirlərinin qadınların həyat keyfiyyəti göstəricilərinə, eləcə də onların psixoloji-emosional vəziyyətinə təsirini tədqiq etmək vəzifəsini qarşıya qoyduq.

*Tədqiqatın məqsədi* ənənəvi müalicəsi və 30%-li karbamid ilə müalicə alan vaginitli xəstələrin həyat keyfiyyətinin müqayisəli aspektdə təhlil edilməsidir.

**Tədqiqatın material və metodları.** Tədqiqat işi Elmi-Tədqiqat Mamalıq-Ginekologiya İnstitutunun bazasında aparılmışdır. Tədqiqata vaginit diaqnostikası təyin edilmiş 120 qadın daxil edilmişdir. Qadınlar tətbiq edilən müalicə sxeminə görə iki qrupa ayrılmışlar. Hər iki qrupa 60 xəstə daxil edilmişdir. Nəzarət qrupu xəstələrə qeyd edilən patoloji proseslərə görə standart iki mərhələli müalicə tətbiq edilmişdir, əsas qrupa 30% karbamidlə müalicə sxemi təyin edilmişdir.




**Şəkil 1. Tədqiqatın dizaynı**

Əsas qrup qadınlara iki mərhələli müalicə rejimi ilə kompleks şəkildə tərikibində 30%-li karbamid olan məhlulla sanasiya və vannalar tətbiq edilmişdir.

**Cədvəl 1.**
**Vaginitliyin tezliyi və residivləri**

| Simptomlar | Müt. (%) (n=120) | Dürüstlük |
|---|---|---|
| İlk dəfə aşkar edilmiş vaginit | 64 (47,4±4,3) | (t≤2,0, p≥0,05) |
| Residivləşmə | 30 (22,2±3,6) | |
| Xarakterik simptomlu | 35 (25,9±3,8) | (t≈4,8, **p≤0,01) |
| Simptomsuz gedişat | 72 (53,3±4,3) | |

Tədqiqata daxil edilən xəstələrdə vagitinlərin tezliyi təyin edildikdə məlum olmuşdur ki, 120 xəstədən 64 nəfərdə xəstəlik ilk dəfə aşkar edilmişdir. 30 xəstədə xəstəliyin residivləşməsi baş vermişdir. 35 xəstədə erkən mərhələdə xarakterik simtpomlar özünü göstərmişdir. 72 xəstədə erkən mərhələdə simptomsuz gedişat olmuşdur.

Vaginit simptomlarını və onların həyat keyfiyyətinə təsirini təyin etmək üçün Erekson E.A. və başqaları tərəfindən hazırlanmış Vulvovaginal Simptomlar Sorğusundan («Vulvovaginal Symptoms Questionnaire (VSQ)») istifadə edilmişdir. Biz tədqiqatımızda bu dəyişiklikdən istifadə etdik. VSQ sorğusu vaginitin simptomların inkişafına, emosional fonun vəziyyətinə qadınların ümumi və cinsi həyat keyfiyyətinə təsirini nəzərdən keçirməyə imkan verir.

**Cədvəl 2.**
**Vulvovaginal simptomlar sorğusu**

| Qiymətləndirmə parametrləri | Cavablar |
|---|---|
| Son 7 gündə sizi bunlar narahat etmişdirmi? | ☐ Xeyr ☐ Bəli |
| Xarici cinsiyyət üzvləri və ya uşaqlıq yolunda qaşınma | ☐ Xeyr ☐ Bəli |
| Xarici cinsiyyət üzvləri və ya uşaqlıq yolunda göynəmə və iynəbatma hissi | ☐ Xeyr ☐ Bəli |
| Xarici cinsiyyət üzvləri və ya uşaqlıq yolunda ağrılar | ☐ Xeyr ☐ Bəli |
| Xarici cinsiyyət üzvləri və ya uşaqlıq yolunda qıcıqlanma | ☐ Xeyr ☐ Bəli |
| Xarici cinsiyyət üzvləri və ya uşaqlıq yolunda quruluq | ☐ Xeyr ☐ Bəli |
| Cinsiyyət yolundan ifrazat | ☐ Xeyr ☐ Bəli |
| Cinsiyyət yolundan pis qoxu | ☐ Xeyr ☐ Bəli |
| Yuxarıda qeyd edilən simptomların yayılması, şiddətlənməsi və ya pisləşməsi sizi narahat edirmi? | ☐ Xeyr ☐ Bəli |
| Sizi xarici cinsiyyət üzvlərinin xarici görünüşü narahat edirmi? | ☐ Xeyr ☐ Bəli |
| Bu simptomların olması sizi məyus edirmi? | ☐ Xeyr ☐ Bəli |

| | |
|---|---|
| Bu simptomların olması sizi utandırırmı? | □ Xeyr □ Bəli |
| Bu simptomlar ətrafdakı insanlarla ünsiyyətinizdə sizə maneəçilik törədirmi? | □ Xeyr □ Bəli |
| Bu simptomlar sizin gündəlik həyatınıza təsir göstərirmi? | □ Xeyr □ Bəli |
| Hazırda sizin cinsi həyatınız varmı? | |
| □Xeyr Sorğunu doldurduğunuz üçün minnətdaram | |
| □Bəli Aşağıdakı 4 suala cavab verin zəhmət olmasa: | |
| Bu simptomlar sizin cinsi həyatınıza mane olurmu? | □ Xeyr □ Bəli |
| Sizdə bu zaman ağrılar olurmu? | □ Xeyr □ Bəli |
| Bu halda sizdə quruluq olurmu? | □ Xeyr □ Bəli |
| Bu halda sizdə qanlı ifrazat olurmu? | □ Xeyr □ Bəli |

Vaginal simptomların intensivliyinin 5 ballıq şkala üzrə qiymətləndirdik (D.Barlow): 1 bal − gündəlik həyata təsir etməyən kiçik problem; 2 xal − gündəlik həyata vaxtaşırı təsir edən narahatlıq; 3 bal − gündəlik həyata təsir edən ciddi təkrarlanan problem; 4 bal − gündəlik həyata daim təsir edən ciddi problem; 5 bal − həyata müdaxilə edən son dərəcə açıq bir problem. Alınan göstəricilərin statistik-riyazi emalı aparılmışdır.

**Cədvəl 3.**
**VSQ sorğusu üzrə tədqiqat qruplarında müalicədən əvvəl xəstələrin kəmiyyət göstəriciləri**

| Göstəricilər | Əsas qrup (n=60) | Nəzarət qrupu (n=60) | p |
|---|---|---|---|
| Simptomların yayılması, şiddətlənməsi və ya pisləşməsi sizi narahat edirmi? | 35 (68,3) | 38 (63,3%) | 0,011 |
| Sizi xarici cinsiyyət üzvlərinin xarici görünüşü narahat edirmir? | 19 (31,6%) | 21 (35%) | 0,003 |
| Bu simptomların olması sizi məyus edirmi? | 27 (45№) | 25 (41,6%) | 0,034 |
| Bu simptomların olması sizi utandırırmı? | 28 (46,6%) | 27 (45%) | 0,285 |
| Bu simptomlar ətrafdakı insanlarla ünsiyyətinizdə sizə meneəçilik törədirmi? | 25 (41,6%) | 24 (40%) | 0,649 |
| Xəstəliyin simptomları sizin gündəlik həyatınıza təsir göstərirmi? | 34 (56,6%) | 33 (55%) | 0,771 |
| Simptomların yayılması, şiddətlənəməsi və ya pisləşməsi sizi narahat edirmi? | 4 (6,6%) | 9 (15%) | 0,007 |
| Sizi xarici cinsiyyət üzvlərinin xarici görünüşü narahat edirmir? | 2 (3,3%) | 5 (8,3%) | 0,679 |
| Bu simptomların olması sizi məyus edirmi? | 3 (5%) | 7 (11,6%) | 0,027 |
| Bu simptomların olması sizi utandırırmı? | 2 (3,3%) | 3 (5%) | 0,075 |
| Bu simptomlar ətrafdakı insanlarla ünsiyyətinizdə sizə meneçilik törədirmi? | 0 | 0 | 0,042 |
| Xəstəliyin simptomları sizin gündəlik həyatınıza təsir göstərirmi? | 1 (1,6%) | 3 (5%) | 0,092 |

**Tədqiqatın nəticələri və onların müzakirəsi.** Aparılan tədqiqat əsasında bütün xəstələrə müalicədən sonra sorğu aparılmışdır. Cədvəl 2-də göstərilən sorğu vərəqəsinin "xeyr" cavabları qruplar üzrə toplanaraq statistik olaraq emal edilmişdir (Cədvəl 3).

Cədvəl 2-dən məlum olduğu kimi əsas qrupda 35 (68,3%) nəfərin, nəzarət qrupunda isə 38 (63,3%) nəfəri vaginitin simptomların yayılması, şiddətlənməsi və ya pisləşməsi narahat

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.255. 2023 / Cild: 17 Sayı: 2 / 77-82 ISSN: 2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 2.255. 2023 / Volume: 17 Issue 2 / 77-82 e-ISSN: 2708-986X

etməmişdir. Bu baxımdan qruplar arasında statistik dürüst fərq olmamışdır. Əsas qrupda 19 (31,6%) nəfəri, 21 (35%) nəfəri xarici cinsiyyət üzvlərinin xarici görünüşü narahat etməmişdir (p<0,003). Hər iki qrupda vaginitin simptomlarının ətrafdakılarla ünsiyyətinə təsir göstərməsinə mənfi cavab verən xəstə olmamışdır. Hər iki sxem üzrə müalicə alan xəstələrdə müalicədən sonra ünsiyyət problemi qalmamışdır.

**Cədvəl 4.**
**Vaginal simptomların intensivliyinin 5 ballıq şkalası üzrə göstəriciləri**

| Simptomların intensivliyi | Əsas qrup | | | Nəzarət qrupu | | |
|---|---|---|---|---|---|---|
| | Müalicədən əvvəl | Müalicədən sonra | p | Müalicədən əvvəl | Müalicədən sonra | p |
| **0** | 0 | 0 | p<0,0001 | 2 (9,5%) | 2 (9,5%) | 0,980 |
| **1,0** | 2 (10,0%) | 13 (65,0%) | | 7 (33,3%) | 9 (42,9%) | |
| **2,0** | 8 (40,0%) | 6 (30,0%) | | 5 (23,8%) | 6 (28,6%) | |
| **3,0** | 9 (45,0%) | 1 (5,0%) | | 4 (19,0%) | 3 (14,2%) | |
| **4,0** | 1 (5,0%) | 0 | | 1 (4,8%) | 1 (4,8%) | |
| **5,0** | 0 (0,0%) | 0 (0,0%) | | 2 (9,5%) | 0 (0,0%) | |

Müalicədən sonra bu xəstələrin sayı artaraq əsas qrupda 13 (65,0%), nəzarət qrupunda 9 (42,9%) olmuşdur. Əsas qrupda bu göstəricinin müalicədən sonra azalması statistik dürüst olmuşdur (p<0,0001). Beş bal əsas qrupda nə müalicədən əvvəl, nə də müalicədən sonra qeydə alınmamışdır. Əsas qrupda 4 bal göstəricisi müaicədən əvvəl 1 (5,0%) nəfərdə olsa da, müalicədən sonra heç bir xəstədə olmamışdır. Nəzarət qrupunda isə müalicədən əvvəl və sonra 1 (4,8%) xəstədə 4 ballıq simptom qeydə alınmışdır.

Müalicədən sonra tədqiq edilən qrupların hər birində xəstələrin həyat keyfiyyəti ümumiyyətlə yaxşılaşmışdır. Bununla belə, ənənəvi müalicə qrupunda "həyata qabiliyyəti" göstəricisində əhəmiyyətli dəyişikliklər baş vermədiyi halda, 3%-li karbamidlə müalicə qrupunda statistik əhəmiyyətli müsbət tendensiya müşahidə edilmişdir. Bununla yanaşı, ənənəvi iki mərhələli müalicə qrupunda cüzi sayda mənfi hadisələr aşağı tezliklə də ola qeydə alınmışdır.

## Ədəbiyyat

1. Zharkin, N.A., Lemyakina, E.V., Burova, N.A. (2012). Complex treatment of nonspecific cervicitis in nulliparous women. Medicines. vestn., No. 8, p.35-39.
2. Sobel, J.D. (2016). Recurrent Vulvovaginal Candidiasis. American Journal of Obstetrics and Gynecology, 214, p.15-21
3. Lebedev, V.A., Pashkov, V.M. (2011). Modern principles of colpitis therapy. Difficult patient, No. 8-9, p.12-16.
4. Pendharkar, S., Brandsborg, E., Hammarström, L., Marcotte, H. and Larsson, P.G. (2015). Vaginal Colonisation by Probiotic Lactobacilli and Clinical Outcome in Women Conventionally Treated for Bacterial Vaginosis and Yeast Infection. BMC Infectious Diseases, 2553.
5. Hardy, L., Jespers, V., Van den Bulck, M. et al. (2017). The presence of the putative Gardnerella vaginalis sialidase A gene in vaginal specimens is associated with bacterial vaginosis biofilm. PloS One, V. 12(2), e0172522.
6. Kira, E.F., Rastorgueva, L.I., Khalturina, Yu.V., Pushkina, V.V. (2020). Vaginal infections. Two-stage method of treatment. Obstetrics and Gynecology, No. 4, p.201-208.
7. Shipidchenko, M.V., Kulygina, Z.P., Isak, A.D. (2016). Substituted ureas. production methods and areas of application in the synthesis of biologically active compounds. Bulletin of the Khidnoukrainian National University named after Volodymyr Dal, No.5(229), p.23-27.

8. Bilardi, J.E., Walker, S., Temple-Smith, M. et al. (2013). The Burden of Bacterial Vaginosis: Women’s Experience of the Physical, Emotional, Sexual and Social Impact of Living with Recurrent Bacterial Vaginosis. PLoS ONE, 8(9): e74378.
9. Bagnall, P., Rizzolo, D. (2017). Bacterial vaginosis: A practical review. JAAPA. Dec; 30(12): p.15-21.
10. Kaambo, E., Africa, C.W.J. (2017). The Threat of Aerobic Vaginitis to Pregnancy and Neonatal Morbidity. Afr J Reprod Health. Jun; 21(2): p.108-118.
11. Adolfsson, A., Hagander, A., Mahjoubipour, F. et al. (2017). How Vaginal Infections Impact Women’s Everyday Life-Women’s Lived Experiences of Bacterial Vaginosis and Recurrent Vulvovaginal Candidiasis. Advances in Sexual Medicine, Vol.7, No.1.
12. Allsworth, J.E. and Peipert, J.F. (2017). Prevalence of Bacterial Vaginosis: 2001-2004 National Health and Nutrition Examination Survey Data. Obstetrics and Gynecology, V.109, p.114-120.

**Rəyçi: t.ü.e.d. Hicran Bağırova**

Göndərildi: 24.11.2022 Qəbul edildi: 30.01.2023

DOI: https://doi.org/10.36719/2663-4619/87/83-88

**Ülviyyə Rasim qızı Şahmalıyeva**
Elmi-Tədqiqat Mamalıq və Ginekologiya İnstitutu
dr.ulviya@mail.ru

# UŞAQLIQ MİOMASI OLAN XƏSTƏLƏRİN KLİNİK-ANAMNESTİK XARAKTERİSTİKASI

## Xülasə

Uşaqlıq miomasının klinik simptomlarının müxtəlifliyini nəzərə alaraq, məqalədə qadınların klinik-anamnestik xarakteristikasının təhlili edilməsi qarşıya məqsəd qoyulmuşdur. Tədqiqat işi 2019-2022-ci illər ərzində Elmi-Tədqiqat Mamalıq və Ginekologiya İnstitutunun bazasında aparılmışdır. Tədqiqata müxtəlif ölçüdə və formada uşaqlıq mioması olan 200 xəstə daxil edilmişdir. I qrupa (n=50) uşaqlıq moması üzrə xərrahi müalicə aparılmış xəstələr, II qrupa (n=50) maqnitləşdirilmiş su, III qrupa (n=50) seolit tərkibli preparatla müalicə, IV qrupa isə (n=50) hormonal müalicə alan xəstələr daxil edilmişdir. Xəstələrin qruplar üzrə yaş həddi belə olmuşdur: I qrup − 35,28±6,15, II qrup − 36,24±4,62, III qrup − 37,94±5,84, IV qrup − 36,86±4,22 yaş. Beləliklə, aparılan tədqiqatdan məlum olur ki, uşaqlıq mioması olan qadınların daha çox hissəsi mərkəzdən kənar rayonlarda yaşamış olmuş, onlar arasında çalışmayan qadınların sayı üstünlük təşkil etmişdir. Başqa sözlə, qadınların hər hansı bir əməklə məşğul olub-olmamasının onda uşaqlıq miomasının inkişafında nəzərəçarpan rol oynamamışdır.

Miomalı qadınlar arasında ümumi zəiflik, ürək bulanması, ağrı, taxikardiya, dizurik simptom və təngnəfəslik yüksək tezliklə aşkar edilmişdir. Bununla yanaşı, qadınlarda xəstəliyin davametmə müddəti kifayət qədər uzun olmuşdur: 6 yaş − 2 il arasında davametmə müddəti qeydə alınmışdır.

***Açar sözlər:*** *uşaqlıq mioması, yaş, şikayətlər, miomanın ölçüsü, hamiləlik*

**Ulviyya Rasim Shahmaliyeva**
Scientific Research Institute of Obstetrics and Gynecology
dr.ulviya@mail.ru

## Clinical and anamnestic characteristics of patients with uterine myoma

## Abstract

Given the variety of clinical symptoms of uterine fibroids, the task was to analyze the clinical and anamnestic characteristics of women. Research work was carried out on the basis of the Research Institute of Obstetrics and Gynecology during 2019-2022. The study included 200 patients with uterine fibroids of various sizes and shapes. Group I (n=50) included patients who underwent surgical treatment of uterine fibroids, group II (n=50) − treated with magnetic water, group III (n=50) − zeolite-containing drug, group IV (n=50 ) received hormonal treatment. patients in the age groups were divided as follows: group I − 35.28±6.15, group II − 36.24±4.62, group III − 37.94±5.84, group IV − 36.86± 4.22 years. Thus, it is known from the study that the majority of women with uterine fibroids lived in regions outside the center, and the number of non-working women prevailed among them. In other words, the employment of a woman in any work did not play a significant role in the development of uterine fibroids. In women with fibroids, general weakness, nausea, pain, tachycardia, dysuric syndrome, and increased respiration were revealed. in addition, the duration of the disease in women was quite long. Recorded duration from 6 months to 2 years.

***Keywords:*** *uterine fibroids, age, complaints, fibroid size, pregnancy*

## Giriş

Qadın reproduktiv xəstəlikləri arasında uşaqlıq mioması liderlik edən xəstəliklərdən olub, 30%-ə qədər təşkil edir. 35 yaşa qədər xəstələrin 25-30%-i bu xəstəlikdən əziyyət çəkir, son illər isə bu xəstəlik daha gənc yaşlı qadınlar arasında rast gəlinir (Tyapaeva, Simonov, Konstantinova, Gritsenko, 2014: 120-124).

Uşaqlıq mioması ən çox rast gəlinən ginekoloji xəstəlik olub, adətən onun müalicəsində cərrahi müdaxilə tələb olunur (Farris, Bastianelli, Rosato, Brosens, Benagiano, 2019: 157-178). ÜST-ün göstəricilərinə əsasən, uşaqlıq mioması əhali arasında qadınlarda ən çox rast gəlinən xoşxassəli şişlərdən biridir (Slabozhankina, Kitaev, Kira, Pirogov, 2015: 51-55).

Uşaqlıq mioması – geniş yayılmış ginekoloji xəstəlik olub, > 30 yaşlı qadınların 20%-də, > 40 qadınların 40%-də qeydə alınır (Kotani, Tobium, Fujishima, Shigeta, Takaya, Nakai, Suzuki, Tsuji, Mandai, Matsumura, 2018: 298-302).



**Şəkil. Uşaqlıq mioması**

Bəzi müəlliflər qeyd edirlər ki, qadınlarda 30 yaşdan sonra mioma riski daha yüksək olur. Uşaqlıq miomasının bədxassəli şişlərinin tezliyi halların 0,18-3,1%-i arasında dəyişir (Kazantseva, Tral, Tolibova, 2021: 5-12).

Miomanın inkişafında müxtəlif növ anomaliyaları olan xəstələr üçün aybaşı pozuntuları, ginekoloji patologiyanın yüksək tezliyi və reproduktiv itkilər xarakterikdir (Kudrina, 2016: 4-10).

Digər müəlliflərin fikrincə, miomalar 30-40% halda heç bir simptoma olmadan baş verir və gedişata malik olur. İri ölçülü miomalar zamanı qarın boşluğunda sıxılma simptomları, bağırsaq və sidik kisəsi disfunksiyası, sidiyin qaçırılması kimi hallara səbəb ola bilir (Donnez, Dolmans, 2016: 665-686; Svirepova, Kuznetsova, Sogoyan, Zelensky, Lolomadze, Mikhailovskaya, 2020: 29-35).

Uşaqlıq miomasının klinik simptomlarının müxtəlifliyini nəzərə alaraq, tərəfimizdən qadınların klinik-anamnestik xarakteristikasının təhlili edilməsini qarşıya məqsəd qoyduq.

**Tədqiqatın material və metodları.** Tədqiqat işi 2019-2022-ci illər ərzində Elmi-Tədqiqat Mamalıq və Ginekologiya İnstitutunun bazasında aparılmışdır. Tədqiqata müxtəlif ölçüdə və formada uşaqlıq mioması olan 200 xəstə daxil edilmişdir. Miomalı xəstələrin mülaicəsinin optimallaşdırılması məqsədilə aparılan tədqiqat işimizinin fraqmenti olaraq, ilk növbədə, uşaqlıq mioması olan qadınların klinik-anamnestik xüsusiyyətlərin öyrəndik. Bu baxımdan xəstələr müalicə üsullarına görə qruplara ayrılmışdır. Bu tədqiqat daxilində şərti olaraq xəstələri 4 qrupa böldük. Bu tədqiqat daxilində müalicə tədbirlərindən əvvəl qadınların klinik-anamnestik göstəricilərinin təhlilini apardıq. I qrupa (n=50) uşaqlıq mioması üzrə cərrahi müalicə aparılmış xəstələr, II qrupa (n=50) maqnitləşdirilmiş su, III qrupa (n=50) seolit tərkibli preparatla müalicə və IV qrupa (n=50) hormonal müalicə alan xəstələr daxil edilmişdir. Xəstələrin qruplar üzrə yaş həddi belə olmuşdur: I qrup − 35,28±6,15, II qrup − 36,24±4,62, III qrup − 37,94±5,84, IV qrup − 36,86±4,22 yaş. Göründüyü kimi qruplar arasında yaş baxımından fərqlər olmamışdır.

Alınan göstəricilərin statistik işlənməsi zamanı parametrik metoddan (Vilkokson (W)) istifadə edilmişdir.

**Tədqiqatın nəticələri və onların müzakirəsi.** Qadınların yaşadığı ərazilər və sosial mənsubiyyəti üzrə təhlilin nəticələri cədvəl 1-də öz əksini tapmışdır.

**Cədvəl 1.**
**Tədqiqat qruplarında qadınların yaşadığı ərazi və çalışmaları haqqında kəmiyyət göstəriciləri**

| Göstəricilər | I qrup | | II qrup | | III qrup | | IV qrup | |
|---|---|---|---|---|---|---|---|---|
| | Müt.r. | % | Müt.r. | % | Müt.r. | % | Müt.r. | % |
| Şəhərdə yaşayan qadınlar | 25 | 48,0 | 29 | 56,0 | 20 | 38,0 | 21 | 40,0 |
| Rayonlarda yaşan qadınlar | 25 | 46,0 | 24 | 46,0 | 25 | 48,0 | 31 | 60,0 |
| İşləyən qadınlar | 20 | 40 | 28 | 56,0 | 22 | 44,0 | 26 | 52 |
| İşləməyən qadınlar | 30 | 60 | 27 | 54 | 30 | 60 | 17 | 34 |

Göründüyü kimi, bütün qruplarda 200 xəstədən cəmi 95 (47,5%) nəfər şəhərdə, 105 (52,5%) nəfər rayon ərazisində, yəni mərkəzdən kənarda yaşamışlar. Yaşadığı ərazilər baxımından xəstələr arasında nəzərəçarpan fərq olmamışdır. Bütün qruplarda 200 qadından 96 nəfər (48%) çalışan, 104 (52%) qadın isə çalışmamışdır. Tədqiqata daxil edilən xəstələr qruplarında hamiləlik və doğuşların sayı da tədqiq edilmişdir (Cədvəl 3).

Göründüyü kimi, tədqiqata daxil edilən 200 xəstədə cəmi 223 hamiləlik olmuş və bu hamiləliklərdən 114-ü doğuşla sona yetmişdir. Bu doğuşlardan 114 doğuşun 71-i (64,1%) qeysəriyyə kəsiyilə sona yetmişdir.

**Cədvəl 3.**
**Tədqiqat qruplarında hamiləlik və doğuşları sayı**

| Göstəricilər | I qrup | II qrup | III qrup | IV qrup |
|---|---|---|---|---|
| hamilə sayı | 80 | 52 | 39 | 52 |
| doğuş | 37 | 29 | 17 | 31 |
| kesar kəsiyi | 27 | 18 | 12 | 14 |

**Cədvəl 4.**
**Miomalı xəstələrdə davametmə müddəti**

| Davametmə müddəti | I qrup | II qrup | III qrup | IV qrup |
|---|---|---|---|---|
| davaetmə (1 ay) | 11 (22,0%) | 11 (22,0%) | 12 (24%) | 11 (22,0%) |
| 3 ay | 8 (16%) | 9 (18%) | 9 (18,0%) | 8 (16,0%) |
| 6 ay | 12 (24%) | 11 (22,0%) | 8 (16,0%) | 10 (20,0%) |
| 1 il | 10 (20%) | 11 (22%) | 14 (28,0%) | 10 (20,0) |
| 2 il | 9 (18) | 8 (16) | 8 (16,0%) | 11 (22,0%) |

Cədvəldən göründüyü kimi, qruplar arasında, eləcə də davaetmə müddəti üzrə xəstələrin sayında fəqlər olmamışdır. Hər 4 qrupda 3 ay müddətində xəstəliyin davametmə müddəti olan xəstələrin sayı daha az olmuşdur. Nisbətən daha çox xəstələr xəstəliyin 1 aylıq davametmə müddətində və 1 il davametmə müddətinaə aşkar edildiyi məlum olur. Ədəbiyyat mənbələri araşdırıldıqda uşaqlıq mioması olan xəstələrdə müxtəlif şikayətlərin olduğu xüsusilə qeyd edilmişdir. Əsas şikayətlər kimi yorğunluq, əzginlik, dağınıqlıq göstərilmişdir (Vorontsov, 2017).

Daha başqa bir tədqiqat işində əzginlik, yorğunluqla yanaşı dizurik simptomlar, xronik anemiya da qeyd edilmişdir (Vorontsov, 2017). Bunları nəzərə alaraq tərəfimizdən xəstələrdə əsas şikayətləri tədqiq etdik. Alınan nəticələr cədvəl 5-də öz əksini tapmışdır.

**Cədvəl 5.**
**Tədqiqat qruplarında şikayətlərin strukturu**

| Şikayətlər | I qrup | | II qrup | | III qrup | | IV qrup | |
|---|---|---|---|---|---|---|---|---|
| | Müt.r | % | Müt.r | % | Müt.r | % | Müt.r | % |
| Ümumi zəiflik | 10 | 20,0 | 26 | 52,0 | 15 | 30,0 | 27 | 54,0 |
| Ürək bulanması, qusma | 8 | 16,0 | 25 | 50,0 | 15 | 30,0 | 14 | 28,0 |
| Ağrı | 3 | 6,0 | 23 | 46,0 | 15 | 30,0 | 24 | 48,0 |
| Aybaşı ilə əlaqəsi olmayan çanaq ağrıları | 3 | 6,0 | 22 | 44,0 | 18 | 36,0 | 12 | 24,0 |
| Dizurik simptomu | 5 | 10,0 | 22 | 44,0 | 21 | 42,0 | 17 | 34,0 |
| Taxikardiya | 7 | 14,0 | 20 | 40,0 | 20 | 40,0 | 13 | 26,0 |
| Təngnəfəslik | 6 | 12,0 | 19 | 38,0 | 16 | 32,0 | 14 | 28,0 |

Cədvəldən göründüyü kimi qruplarda dah çox ümumi zəiflik, dizurik simptomlar üstünlük təşkil etmişdir. Hər qrupda daha az təngnəfəslik şikayəti olmuşdur, dizurik simptomu I qrupda daha az olsa da, digər quplarda kifayət yüksək tezlikli aşkar edilmişdir.

**Cədvəl 6.**
**Miomatoz düyünlərin xarakteristikasının kəmiyyət göstəriciləri**

| Göstəricilər | I qrup | | II qrup | | III qrup | | IV qrup | |
|---|---|---|---|---|---|---|---|---|
| | Müt.r | % | Müt.r | % | Müt.r | % | Müt.r | % |
| İri ölçülü mioma | 34 | 68,0 | 7 | 14,0 | 9 | 18,0 | 6 | 12,0 |
| Çöxdüyünlü mioma | 10 | 20,0 | 16 | 32,0 | 16 | 32,0 | 24 | 48,0 |

Uşaqlıq miomalarının ölçüləri təhlil edildikdə məlum olur ki, daha çox iri ölçülü miomatoz düyünlər I qrupda aşkar edilmişdir. Məhz bu səbəbdən həmin qrupa cərrahi mdaxilə tətbiq edilmişdir. Bütün qruplarda çoxdüyünlü miomaların sayı daha çox olmuşdur. Lakin iri ölçülü düyünlər digər 3 qrupda daha az olmuşdur. Bunun səbəbi həmin xəstələrin, əsasən medikamentoz müalicə üçün tədqiqata cəlb edilməsində olmuşdur. Daha çox iri ölçülü miomalar əsas müalicə metodu isə məlum olduğu kimi cərrahi müdaxilə olmuşdur.

Beləliklə, aparılan tədqiqatdan məlum olur ki, uşaqlıq mioması olan qadınların daha çox hissəsi mərkəzdən kənarda rayonlarda yaşamış olmuş, onlar arasında çalışmayan qadınların sayı üstünlük təşkil etmişdir. Başqa sözlə, qadınların hər hansı bir əməklə məşğul olub-olmamasının onda uşaqlıq miomasının inkişafında nəzərəçarpan rol oynamamışdır.

Miomalı qadınlar arasında ümumi zəiflik, ürək bulanması, ağrı, taxikardiya, dizurik simptom və təngnəfəslik yüksək tezliklə aşkar edilmişdir. Bununla yanaşı, qadınlarda xəstəliyin davametmə müddəti kifayət qədər uzun olmuşdur: 6 yaş − 2 il arasında davametmə müddəti qeydə alınmışdır.

Beləliklə, uşaqlıq mioması uşaqlıq yolunun damar divarının hamar əzələ hüceyrələrindən inkişaf edən xoşxassəli monoklonal şiş olub, ginekoloji xəstəliklərin strukturunda aparıcı yer tutur, qadınların reproduktiv sağlamlığına və həyat keyfiyyətinə mənfi təsir göstərir (Kudrina, Baburin, Snegirev, 2016: 4-10). Hazırda uşaqlıq miomasının inkişafına baxış keyfiyyətcə dəyişmişdir. Uşaqlıq mioması olan bir xəstənin idarə edilməsi taktikasına müşahidə və monitorinq, cərrahi müalicənin müxtəlif üsulları, yeni minimal invaziv yanaşmaların istifadəsi, dərman müalicəsi, həyat tərzi ilə bağlı tövsiyələr (epigenomik risk faktorlarının aradan qaldırılması) daxildir. Bunların da yüksək keyfiyyətlə aparılmasında xəstələrin ətraflı klinik müayinəsinin aparılması və ətraflı anamnestik məlumatların toplanması böyük əhəmiyyət kəsb edir.

## Ədəbiyyat

1. Tyapaeva, Ya.V., Simonov, A.A., Konstantinova, O.D., Gritsenko, V.A. (2014). Analysis of surgical activity in uterine myoma. Analysis of surgical activity in uterine myoma. No. 13, p.120-124.
2. Farris, M., Bastianelli, C., Rosato, E., Brosens, I., Benagiano, G. (2019). Uterine fibroids: an update on current and emerging medical treatment options. Ther Clin Risk Manag, p.157-178.
3. Slabozhankina, E.A., Kitaev, V.M., Kira, E.F. (2015). The effectiveness of ultrasonic HIFU-ablation of uterine fibroids depending on the MR-types of myomatous nodes. Bulletin of the National Medical and Surgical Center. N. I. Pirogov. No. 1, p.51-55.

4. Kotani, Y., Tobiume, T., Fujishima, R., Shigeta, M., Takaya, H., Nakai, H., Suzuki, A., Tsuji, I., Mandai, M., Matsumura, N. (2018). Recurrence of uterine myoma after myomectomy: Open myomectomy versus laparoscopic myomectomy. J Obstet Gynaecol Res. Feb; 44(2): p.298-302.
5. Kazantseva, E.V., Tral, T.G., Tolibova, G.Kh. (2021). Clinical and anamnestic data and morphofunctional characteristics of the endometrium in women with uterine developmental anomalies. Journal of Obstetrics and Women’s Diseases, No. 2, p.5-12.
6. Clinical and anamnestic features of patients with fibromyoma of the uterine body operated on in the gynecological department of the Belgorod Oncological Dispensary in 2011-2014. Medico-social expertise and rehabilitation. (2015). Volume 18, No. 3, p.7-10.
7. Kudrina, E.A., Baburin Dmitry Valerievich. (2016). Uterine fibroids: modern aspects of pathogenesis and treatment (clinical lecture). Archive of obstetrics and gynecology named after. V. F. Snegirev. No. 1, p.4-10.
8. Sparic, R., Mirkovic, L., Malvasi, A., Tinelli, A. (2016). Epidemiology of uterine myomas: a review. Int J Fertil Steril; 9(4): p.424-435.
9. Donnez, J., Dolmans, M.M. (2016). Uterine fibroid management: from the present to the future. Human Reproduction Update, Vol.22, No.6, p.665-686.
10. Svirepova, K.A., Kuznetsova, M.V., Sogoyan, N.S., Zelensky, D.V., Lolomadze, E.A., Mikhailovskaya, G.V. (2020). Hereditary risk factors for the development of uterine fibroids: the search for marker single nucleotide polymorphisms. Vestnik RSMU; (1): 29-35.
11. Vorontsov, I.M. (2017). Optimization of X-ray endovascular diagnosis and treatment of uterine fibroids 01/14/13. Radiation diagnosis, radiation therapy (medical sciences): Abstract of the thesis. candidate of medical sciences Omsk-2017.
12. Kudrina, E.A., Baburin, D.V. (2016). Uterine fibroids: modern aspects of pathogenesis and treatment (clinical lecture). 3(1):4-10.

**Rəyçi: t.ü.e.d. Hicran Bağırova**

Göndərildi: 21.10.2022 Qəbul edildi: 03.02.2023

## TEXNİKA ELMLƏRİ

## TECHNICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/87/89-102

**Cahan Arif qızı Əhmədova**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
texnika üzrə fəlsəfə doktoru
ahmedova_cahan1975@mail.ru
**Olqa Oleqovna Əliyeva**
Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin nəzdindəki
"Neftin, Qazın Geotexnoloji Problemləri və Kimya Elmi Tədqiqat İnstitutu"
texnika elmləri namizədi
olga_da@mail.ru

# DƏNİZ SUYUNUN ŞİRİNLƏŞDİRİLMƏSİ ÜÇÜN GÜNƏŞ ENERJİLİ MEMBRAN DİSTİLLƏ TEXNOLOGİYASI

**Xülasə**

Məqalədə günəş enerjili membran distillə üsulu ilə Xəzər dənizi suyunun şirinləşdirilmə texnologiyasının tədqinin nəticələri gətirilir. Birbaşa kontaktlı membran modulunun istifadəsi və membran üzərində ərpin yaranmasının qarşısını almaq üçün dəniz suyunun yumşaldılması nəzərdə tutulmuşdur. Şirinləşdirmə texnologiyasının hesablama modeli işlənilmişdir və onun kompüter simulyasiyası ilə əsas giriş dəyişənlərinin prosesinin texnoloji göstəricilərinə təsiri tədqiq edilmişdir. Müəyyən edilmişdir ki, günəş enerjisinin intensivliyi 300÷900 Vt həddində dəyişdikdə, qəbul edilmiş digər ilkin şərtlər çərçivəsində, 1 kq şirinləşdirilmiş su almaq üçün günəş enerjisinin sərfi 3,6÷7,0 MC, günəş kollektorunun xüsusi səthinin sahəsi 5,7÷45 $m^2$/(kq/saat), membranın xüsusi səthinin sahəsi 0,36÷1,12 $m^2$/(kq/saat) təşkil edir. Bu texnologiya ilə Xəzər dənizi suyunun duzluluğunu 12,8 q/$dm^3$-dan 60÷120 q/$dm^3$-ə çatdırılmaqla, qalıq duzluluğu 10 mq/$dm^3$ olan şirinlədirilmiş su (distillyat) almaq olar. Sistemə verilən yumşaldılmış dəniz suyunun 86÷89%-i şirinləşdirilmiş suya konversiya olunur.

Təklif edilən hesablama modeli universaldır – digər duzlu suların şirinləşdirmə sistemlərinin tədqiqində də istifadə edilə bilər.

***Açar sözlər:*** *günəş enerjisi, dəniz suyu, şirinləşdirmə, membran distillə, hesablama modeli, kompüter simulyasiyası*

**Jahan Arif Ahmadova**
Azerbaijan State Oil and Industry University
Ph.D in Engineering
ahmedova_cahan1975@mail.ru
**Olga Olegovna Aliyeva**
Under the Azerbaijan State Oil and Industry University
"Geotechnological Problems of Oil, Gas and Chemical Scientific Research Institute"
Candidate of Technical Sciences
olga_da@mail.ru

## Solar powered membrane distillation technology for seawater desalination

### Abstract

The article presents the results of technological research on desalination of Caspian sea water by membrane distillation using solar energy. The use of a membrane module for direct contact and softening of sea water is provided to prevent the formation of scale on the membrane. The calculation model of desalination technology was developed and its influence on the technological indicators of the process of the main input variables was studied by computer simulation. It is determined that when the intensity of solar energy changes within 300÷900 W, within the framework of other accepted initial conditions, the consumption of solar energy for obtaining 1 kg of desalinated water is 3,6÷7,0 MJ, the specific surface area of the solar collector is 5,7÷45 $m^2$/(kg/h), membrane specific surface 0,36÷1,12 $m^2$/(kg/h). According to this technology, when the salinity of the Caspian Sea water is increased from 12,8 g/$dm^3$ to 60÷120 g/$dm^3$, it is possible to obtain desalinated water (distillate) with a residual salinity of 10 mg/$dm^3$. 86÷88% of the softened sea water supplied to the system is converted into desalinated water.

The proposed calculation model is universal − it can be used in the study of desalination systems of other salt waters.

***Keywords:*** *solar energy, sea water, desalination, membrane distillation, calculation model, computer simulation*

### Giriş

Müasir dövrün dünyəvi xarakter daşıyan aktual problemlərindən biri təmiz (içməli) suyun çatışmazlığı problemidir. Tədqiqatçılat belə vəziyyətin yaranmasının əsas səbəbləri kimi əhalinin sayının artmasını (2030-cu ilə 9 milliard gözlənilir), təmiz su ehtiyatlarının çox məhdud olmasını (Yer kürəsinin su ehtiyatlarının ancaq 0,5%-i əlçatan şirin su mənbələrinin payına düşür) və qeyri bərabər paylanmasını, sənaye müəssisələrinin və kənd təsərrüfatının inkişafını, insanların yaşayış səviyyəsinin yüksəlməsini və s. göstərirlər (Curto, Franzitta, Guercio, 2021).

Dünyanın bəzi regionlarında (Şimali Afrika ölkələri, Səudiyyə Ərəbistanı, Küveyt, İsrail və s.) şirin su çatışmazlığı problemi hələ keçən əsrin ortalarından aktuallaşmışdır, onun həlli üçün müəyyən araşdırmalar aparılmış, praktiki işlər görülmüş və təcrübə əldə edilmişdir (Furqan Tahir, 2020: 303-329). Bu təcrübə göstərir ki, yaranmış problemin həlli üçün əsas yol, ehtiyatları praktiki tükənməz olan, Yer kürəsinin su balansında payı 97,5%-ə çatan duzlu suların (dəniz, okean və yeraltı şoran) şirinləşdirilməsidir: duzluluğunu 3÷50 q/$dm^3$-dan 1 q/$dm^3$-a və daha kiçik qiymətlərə çatdırmaqdır.

Azərbaycan Respublikası daxil olmaqla Xəzər dənizi sahilində yerləşən beş ölkənin dördündə şirin su qıtlığı yaşandığından duzluluğu 12÷13 q/$dm^3$ olan Xəzər dənizinin suyunun şirinləşdirilməsi də son 10÷15 ildə aktuallaşmışdır.

Müasir dövrdə duzlu suların şirinləşdirilməsi üçün müxtəlif üsullar istifadə edilir. Prosesin təşkili üçün 4 növ enerjidən istifadə olunur: istilik, mexaniki, elektrik, kimyəvi. Sənayedə geniş tətbiq olunan şirinləşdirmə texnologiyalarının təsnifatı [3]-də gətirilir. Onların müqayisəsindən görmək olar ki, ən geniş istifadə olunan əks-osmos texnologiyasıdır (65%) və onun üç çatışmayan cəhəti vardır: şirinləşdirilmiş suyun payının kiçik olması (42÷65%), qalıq duzluluğun yüksək olması (200÷500 mq/$dm^3$), elektrik enerjinin sərfinin yüksək olması (Peter, 2015: 402-422).

Bu çatışmazlıqlardan azad olan yeni perspektivli şirinləşdirmə texnologiyalarından biri membran distillə (MD – Membrane Distillation) texnologiyasıdır (Enrico Drioli, 2015: 56-84). MD texnologiyasına görə mikroməsaməli hidrofob membranın bir tərəfinə temperaturu 50÷90$^0$C şirinləşdirilən duzlu su verilir. Membranın isti və soyuq tərəflərində temperatur düşküsü səbəbindən yaranan su buxarının parsial təzyiqlərin fərqi təsirindən su buxarının molekulları membranın məsamələrindən keçir. Soyuq tərəfdə su buxarının kondensatlaşması variantlarından asılı olaraq MD modulların 4 əsas növü işlənilmişdir: a) Birbaşa kontaktlı; b) Hava təbəqəli; c) Vakuumlu; d) Buxarın qazla sıxışdırılması. Birinci halda membrandan keçən su buxarının kondensatlaşması

soyudulmuş distillyatla birbaşa kontakt nəticəsində baş verir. İkinci halda buxarın kondensatlaşması hava təbəqəsində aparılır. Üçüncü halda membrandan keçmiş su buxarı vakuum vasitəsi ilə xüsusi soyuducu qurğuya verilir və orada kondensatlaşdırılır. Dördüncü halda su buxarı inert qaz vasitəsi ilə soyuducu qurğuya sıxışdırılır və orada kondensatlaşdırılır. Hər kondensatlaşma variantının üstün və çatışmayan cəhətləri, eləcədə əlverişli tətbiq sahələri vardır (Daniel Gonzalez, 2017: 238-259; Ruh Ullah, Rasul, 2019: 119). Amma daha dərin tədqiq edilmiş və yarım sənaye miqyasında tətbiq edilən – MD texnologiyasının birbaşa kontaktlı variantıdır.

Ədəbiyyatda MD texnologiyasının müsbət xüsusiyyətləri kimi aşağıdakılar qeyd olunur:

- MD prosesi kiçik temperaturlarda ($50 \div 90^0$C) həyata keçirilir. Ona görə duzlu suyun qızdırılması üçün günəş və geotermal enerjidən, eləcə də tullantı yanma məhsullarının istiliyindən (ikinci enerji ehtiyatlarından) istifadə edilə bilər;
- Bütün membran qurğuları kimi, MD qurğuları da modul tiplidirlər: yığcamdırlar, az yer tuturlar, yüksək təzyiq tələb etmirlər, istismarı asandır;
- Ərpin yaranmasının qarşısını almaq şərti ilə şirinləşdirilən suyun konsentrasiyası yüksək qiymətlərədək artırıla bilər ($100 \div 200$ q/dm$^3$). Nəticədə alınan distillyatın payı artır, qalıq konsentratın həcmi azalır, utilizasiyası sadələşir, digər şirinləşdirmə texnologiyaları ilə hibridləşdirmə imkanı yaranır;
- Əks-osmos texnologiyasından fərqli olaraq şirinləşdirilmiş suyun qalıq duzluluğu çox kiçik həddə düşür – 10 mq/dm$^3$-dək;
- MD texnologiyası kiçik həcmdə şirin su tələb edən ayrı-ayrı istehlakçılar üçün (kiçik qazanxanalar, fermer təsərrüfatları və s.) daha səmərəlidir.

MD texnologiyasının əsas çatışmayan cəhəti kimi istilik enerji sərfinin yüksək olması göstərilir: 100 kVt·saat/m$^3$-dək (Ruh Ullah, 2018: 56-67). Ona görə ancaq bərpa olunan və ikinci enerji mənbələrinin istifadəsi bu texnologiyanı iqtisadi baxımdan səmərəli edir. Həlli tələb olunan ən vacib məsələ kimi membran üzərində müxtəlif növ çöküntülərin, ilk növbədə $CaCO_3$ və $CaSO_4$ ərpinin yaranmasının qarşısının alınması göstərilir. Bu məsələnin həllində xam suyun keyfiyyətinin və MD qurğusunun iş parametrlərinin düzgün seçilməsinin vacibliyi vurğulanır (Enrico Drioli, 2015: 56-84).

Qeyd edilənləri nəzərə alaraq günəş radiasiyasının intensivliyi yüksək olan regionlar üçün həmin enerjidən istifadə etməklə membran distillə üsulu ilə müxtəlif ion tərkibli duzlu suların şirinləşdirilmə texnologiyasının ayrı-ayrı məsələləri araşdırılmışdır. Məsələn, [9]-da duzluluğu 6 q/dm$^3$ olan yeraltı şoran suyun şirinləşdirilmə prosesi tərkibində günəş kollektoru və birbaşa kontaktlı MD modulu olan kiçik eksperimental qurğuda aparılmışdır. MD modulunun isti kamerasında suyun duzluluğu 50 q/dm$^3$-ə çatdırılmışdır. Müəyyən edilmişdir ki, havanın temperaturu $25 \div 33^0$C olduqda günəş radiasiyasının intensivliyi 7 saat ərzində yüksək olur ($330 \div 770$ Vt/m$^2$) və qurğuda sutka ərzində orta hesabla 13,7 kq distillyat alınır.

Digər tədqiqatda MD modulunu günəş hövzəsi ilə kombinəşdirilmiş sxeminin imkanları araşdırılmışdır. Göstərilmişdir ki, günəş radiasiyasının yüksək intensivliyi şəraitində MD modulunun isti kamerasında temperatur $50 \div 70^0$C-yə, qalıq konsentratın duzluluğu 230 q/dm$^3$-dək çatdırıla bilər (Kawtar Rahaoui, 2017: 414-419).

Son illər günəş enerjili MD (GEMD) şirinləşdirmə texnologiyasının iqtisadi məsələləri tədqiqat predmeti olmuşdur. Məsələn, [11]-də Tayvan adası üçün müxtəlif növ MD modullarının müqayisəsi aparılmışdır və göstərilmişdir ki, ən kiçik maya dəyəri (2,71 ABŞ dol/m$^3$ şirinləşdirilmiş su) hava təbəqəli MD modulunda alınır. Amma birbaşa kontaktlı MD-lərin istismarı daha sadədir.

İstilik mənbəyindən asılı olmayaraq MD texnologiyasının ən mürəkkəb məsələlərindən biri membranlar üzərində kalsium ərpinin yaranmasının qarşısının alınmasıdır. Bu məsələ ilə əlaqədar [12]-də göstərilir ki, əsas problem gipsin yaranmasıdır (CaSO4·2H2O).

Ərp məsələsinə həsr olunmuş digər tədqiqatlarda antiərplərin bahalığını nəzərə alaraq göstərilir ki, əks-osmos şirinləşdirmə texnologiyasında olduğu kimi, $CaSO_4$ ərpinə qarşı antiərplərdən, $CaCO_3$ ərpinə qarşı – sulfat turşusundan istifadə edilməsi məqsədə uyğundur (Gryta, 2008: 128-134, Sergio, Salinas-Rodriguez, 2021: 301).

Azərbaycan və Rusiya istisna olmaqla, digər Xəzəryanı ölkələrin təbii iqlimi günəş enerjisindən elektrik və istilik enerjilərinin alınması ilə bərabər duzlu suların şirinləşdirilməsi üçün də geniş imkanlar açır.

Məlum araşdırmalara görə Azərbaycanda orta aylıq şüalanma sıxlığı kifayət qədər yüksəkdir və $142 \div 724$ MC/$m^2$ həddində dəyişir (15). Bütün bunları nəzərə alaraq günəş enerjisindən istifadə etməklə membran distillə üsulu ilə Xəzər dənizi suyunun şirinləşdirilməsi şirin su qıtlığı məsələsinin həlli yollarından biri ola bilər. Yüksək ərp əmələ gətirmə xüsusiyyətinə malik olan Xəzər dənizi suyu üçün GEMD texnologiyasının imkanları hal-hazıradək araşdırılmamışdır.

İşin məqsədi Xəzər dənizi suyunun günəş enerjili membran distillə (şirinləşdirmə) texnologiyasının analitik üsulla tədqiq edilməsindən ibarətdir. Qoyulan məqsədə nail olmaq üçün membran üzərində kalsium ərplərinin yaranmasının qarşısının alınması, günəş kollektorlu MD qurğusunun hesablama modelinin işlənilməsi, modelin kompüter simulyasiyası əsasında sistemin tədqiqi kimi məsələlərə baxılır.

**Günəş enerjili MD texnologiyasının prinsipial sxeminin və onun tədqiqat üsulunun seçilməsi.**

Membran üzərində ərpin yaranmasının qarşısının alınması ilə əlaqədar, GEMD texnologiyasının sadələşdirilmiş hesablama metodikasına həsr olunmuş araşdırmada, bizim tərəfimizdən göstərilmişdir ki, Xəzər dənizinin ekoloji həssaslığını nəzərə alsaq məlum antiərp üsulu əvəzinə Na-kationlaşdırma üsulundan istifadə etmək daha məqsədə uyğundur (Zantaporn Waritha, 2017: 15-26). Nəzərə alınmışdır ki, antiərplərin bir çoxu toksikoloji xassəyə malikdir (Ashraf Al-Ashhab, 2022).

Təcrübə göstərir ki, nəticə etibarı ilə antiərplər heç bir dəyişikliyə məruz qalmadan şirinləşdirmə prosesinin qalıq konsentratının tərkibində dənizə axıdılaraq flora və faunaya neqativ ekoloji təsir göstərir. Bununla əlaqədar ekoloji baxımdan təmiz (“yaşıl”) antiərplərin yaradılması istiqamətində tədqiqat işləri aparılır (Konstantin Popov, 2016: 1-10).

Mövcud olan digər üsullardan, ekoloji təmizlik baxımından şirinləşdirilməyə verilən dəniz suyunun əvəlcədən Na-kationlaşdırma üsulu ilə yumşaldılmasını, yəni ərp əmələ gətirən $Ca^{2+}$ və $Mg^{2+}$ ionlarının $Na^{+}$ ionları ilə əvəz olunmasını göstərmək olar. Bu istiqamətdə termiki distillə qurğularında ərpin qarşısını almaq üçün ilk tədqiqatlara professor H.Q.Feyziyevin rəhbərliyi altında hələ keçən əsrin 70-80-ci illərində başlanılmışdır (Feyziyev, 2009: 442).

Bunu nəzərə alaraq şəkil 1-də Na-GEMD texnologiyasının prinsipial sxemi təklif olunur. Bu sxemə görə dəniz suyu aşağıdakı əsas emal mərhələlərindən keçir: şəffaflaşdırma, yumşaldılma və şirinləşdirmə. Sistem üç konturdan ibarətdir. Birinci konturda günəş enerjisindən isti su halında istilik enerjisi alınır; ikinci (aralıq) konturda istilik enerjisi membran distillə modulunun (MDM) isti hissəsində dövr edən bəsləyici suya ötürülür; üçüncü konturda isə alınan distillyat soyudularaq dövr etdirilir və bir hissəsi məqsəd məhsulu kimi yığılır.

Sistemə daxil olan dəniz suyu (DS) distillyat soyuducusundan (DSY) keçərək turşulaşdırma (T) mərhələsindən sonra mexaniki süzgəcdə (M) şəffaflaşdırılır. Şəffaflaşdırılmış su Na-kationit süzgəcində (Na) yumşaldılaraq ikinci konturun qidalandırılması üçün istifadə olunur. Alınan su qarışığı istilikdəyişdiricidə (İD) günəş enerjisi hesabına $50 \div 80^0$C-dək qızdırılır və MDM-in girişinə verilir. Suyun bir hissəsi MDM-in membranından keçərək distillyat halında sonuncu kontura daxil olur.

İkinci (isti) konturdan üflənən və tərkibində ancaq dəniz suyunun natrium xlorid və natrium sulfat duzları olan $6 \div 12$%-li konsentrat Na-kationit süzgəcinin regenerasiyasına istifadə olunur. Ancaq birinci (işə buraxma) mərhələsi istisna olmaqla, kənardan NaCl duzunun istifadəsinə ehtiyac qalmır. Ona görə dəniz suyunun yumşaldılması iqtisadi baxımdan səmərəli hesab olunur. Kationitin regenerasiya prosesində əmələ gələn tullantı məhlulun (işlənmiş regenerasiya məhlulunun) tərkibində $6 \div 7$ dəfə qatılaşmış halda, ancaq dəniz suyunun ionları olur. Bu isə üsulun ekoloji səmərəliliyini göstərir.




**Şəkil 1. Dəniz suyunun şirinləşdirilməi üçün günəş enerjili membran distillə sisteminin prinsipial sxemi: M – mexaniki süzgəc; Na – Na-kationit süzgəci; MDM – membran distillə modulu; İD – istilikdəyişdirici; DSY – distilat soyuducusu; GK – günəş kollektoru; DS – dəniz suyu; D – distillyat; TS – tullantı su; T – turşu məhlul; TM – tullantı məhlul; 1,2,3,4 – nasoslar.**

Təklif edilən Na-GEMD sisteminin hesablama və tədqiqat üsuluna gəldikdə, hesablama metodikası bizim tərəfimizdən ədəbiyyat (16)-da dərc edilmişdir. Hesablama metodikasının işlənilməsində sistemin ayrı-ayrı elementlərinin hesablanması üçün aşağıdakı ədəbiyyatlardan istifadə olunmuşdur: günəş kollektorunun – (20)-dən; MD modulunun – (21,22)-dən; Na-kationinit süzgəcinin – (19)-dan. Ona görə aşağıda gətirilmiş hesablama modelinə istinad edilən metodikanın yalnız əsas elementləri daxil edilmişdir.

Tədqiqatlarda "Gelman" şirkətinin istehsalı olan birbaşa kontaktlı membran modulunun istifadə edilməsi nəzərdə tutulmuşdur. Membranın texnoloji göstəriciləri: qalınlıq (δ) – 60 mkm; məsaməlik (ε) – 80%; məsamələrin orta radiusu (r) – 0,225 mkm (Weiming, Yongli, 2020: 179). Xəzər dənizi suyunun ion tərkibi aşağıdakı kimi qəbul olunmuşdur ($mq/dm^3$): $Ca^{2+}$=320,9; $Mg^{2+}$=729,9; $Na^{+}$=3174,9; $Cl^{-}$=5034,3; $SO_4^{2-}$=3264,0; $HCO_3^{-}$=244,0; Duzluluq – 12768.

**Hesablama modelinin əsas elementləri**

Günəş kollektoru (GK) və istilik dəyişdiricidən (İD) ibarət olan birinci konturun istilik balans tənliyi, kVt:

$$Q_{GK}=Q_{İD} \quad (1)$$

və ya

$$q \cdot 10^{-3} \cdot F_{GK} \cdot \eta_K = G_1 \cdot C_p \cdot (t_{İs.1} - t_{S.1}) \quad (2)$$

burada q – günəşin şüalanma sıxlığı, $Vt/m^2$; $F_{GK}$ – GK-nin səthinin cəm sahəsi, $m^2$; $\eta_K$ – kollektorun optik f.i.ə.; $G_1$ – birinci konturda dövr edən suyun sərfi kq/san; $C_p$ – suyun xüsusi istilik tutumu, $kC/(kq \cdot {}^0C)$; $t_{İs.1}$ – isti suyun temperaturu, ${}^0C$; $t_{S.1}$ – soyuq suyun temperaturudur,${}^0C$.

Bu konturda adətən istilikdaşıyıcı kimi təmiz su (distillyat) istifadə edilir. Sistemdə suyun qaynamasının qarşısını almaq məqsədilə hesablamalar yay rejiminin maksimal şüalanma səviyyəsinə görə aparılır. Bakı şəhəri üçün bu iyul ayına təsadüf edir və günün ən isti saatlarında təxminən q=900 $Vt/m^2$ təşkil edir (15).

GK-nin səthinin cəm sahəsi belə hesablanır:

$$F_{GK} = F1 \cdot n \quad (3)$$

burada F1 – qəbul edilmiş standart kollektorun süa udan səthinin sahəsidir, $m^2$; n – kollektorın sayıdır, ədəd.

İstehsal olunan kollektorlardan "Buderus SKN 4.0" markalı kollektorlar seçilmişdir. Onun üçün F1=2,4 $m^2$; $\eta_K$=0,77 (20).

Düstur (1)-lə yanaşı İD-in istilik balans tənliyi belə də yazıla bilər:

$$G_1 \cdot C_p \cdot (t_{İs.1} - t_{S.1}) \cdot \eta_{İD} = G_2 \cdot C_p \cdot (t_{İs.2} - t_{S.2}) \quad (4)$$

burada $\eta_{İD}$ – istilik dəyişdiricinin f.i.ə.-dir, $\eta_{İD}$ = 0,98; $G_2$ – İD və MDM arasında (ikinci konturda) dövr edən duzlu suyun sərfidir, kq/san; $t_{İs.2}$ və $t_{S.2}$ – uyğun olaraq, ikinci konturda dövr edən isti (MDM-ə daxil olan) və soyuq suyun (MDM-in qalıq məhlulu ilə qidalandırıcı suyun qarışığının) temperaturlarıdır, $^0C$: $t_{İs.2}=t_{İs.1}-5^0C$ qəbul edilir.

Şəkil 1-də gətirilmiş sxemdən göründüyü kimi, MDM-in isti konturuna daxil olan duzlu su ($G_2$) iki hissəyə ayrılır: membrandan keçən distillyata (şirinləşdirilmiş suya) – $G_Ş$ və qalıq məhlula – $G_{Qal.}$ Sonuncunun bir hissəsi Na-kationit süzgəcinin regenerasiyasına istifadə olunur – $G_{Req,}$ qalan hissəsi isə qidalandırıcı su ilə qarışdıqdan sonra ($G_{Qid}$) ilkin qiymətinə çatır və İD-in girişinə verilir. Odur ki, axınlara və duzlara görə aşağıdakı maddi balans tənliklərini yaza bilərik:

$$G_2 = G_Ş + G_{Qal} \quad (5)$$

$$G_2 \cdot S_B = G_Ş \cdot S_Ş + G_{Qal} \cdot S_{Qal} \quad (6)$$

$$G_{Qid} = G_{Req} + G_Ş \quad (7) \quad G_{Qid} \cdot S_{Qid} = G_{Req} \cdot S_{Req} + G_Ş \cdot S_Ş \quad (8)$$

$$G_Ş = G_2 \cdot KƏ_B \quad (9)$$

$$S_{Req} = S_{Qid} \cdot QF \quad (10)$$

burada $S_B$, $S_{Qal}$, $S_{Qid}$, $S_{Req}$ və $S_Ş$ – uyğun olaraq, MDM-in bəsləyici və qalıq sularının, sistemin qidalandırıcı suyunun, regenerasiya məhlulunun və şirinləşdirilmiş suyun duzluluqlarıdır, mq/dm$^3$ (q/dm$^3$); QF – şirinləşdirilən suyun qatılaşma faktorudur; $KƏ_B$ – MDM-in isti kamerasına verilən bəsləyici suyun konversiya əmsalıdır.

MDM-də alınan şirinləşdirilmiş suyun sərfi modulun iş parametrlərindən və istifadə olunan membranın texniki göstəricilərindən, onun səthinin sahəsindən ($F_M$) asılıdır, м$^2$:

$$F_M = G_Ş/J \quad (11)$$

burada J – membranın xüsusi məhsuldarlığıdır, kq/(m$^2$·san):

$$J = B_M\left(P_1(t_{İs}) \cdot X_{Su} \cdot a_{Su} - P_2(t_S)\right) = B_M \cdot \Delta P \quad (12)$$

burada $B_M$ – membranın nüfuz etmə əmsalıdır, kq/(m$^2$·san·Pa); $P_1(t_{İs})$ və $P_2(t_S)$ – təmiz su üzərində membranın isti və soyuq səthlərinin temperaturlarına uyğun su buxarının təzyiqidir, Pa; $X_{Su}$ – MDM-in isti kamerasına daxil olan məhlulda suyun molyar payıdır; $a_{Su}$– suyun aktivlik əmsalıdır; ΔP – membran distillə prosesinin hərəkətetdirici qüvvəsidir, Pa.

Membranın nüfuz etmə əmsalı aşağıdakı düsturla hesablanır:

$$B_M = \left[\frac{3\tau\delta}{2\varepsilon r} \cdot \left(\frac{\pi RT}{8M}\right)^{1/2} + \frac{\tau\delta}{\varepsilon} \cdot \frac{Pa}{PD} \cdot \frac{RT}{M}\right]^{-1} \quad (13)$$

burada ε, r və δ – membranın yuxarıda gətirilmiş texnoloji göstəriciləridir; τ – membranın əyilmə əmsalıdır, payla; M – suyun molyar kütləsidir, q/mol; R – universal qaz sabitidir, C/(mol·K); T – membranın orta temperaturudur, K; Pa – membranın məsamələrində havanın təzyiqidir, Pa; PD – membranın məsamələrindəki təzyiqin və diffuziya əmsalının hasilidir, Pa·m$^2$/san.

$$\tau = 1/\varepsilon \quad (14)$$

$$PD = 1,895 \cdot 10^{-5} \cdot T^{2,072} \quad (15)$$

Düstur (13) daxil olan membranın isti və soyuq səthlərində buxarın temperaturundan asılı olan təzyiqlər ($P_1$ və $P_2$) Antuan düsturu ilə hesablana bilər [22], Pa:

$$P = \exp(23,1964 - 3816,44/(T_B - 46,13)) \quad (16)$$

burada $T_B$ – membranın isti və soyuq səthlərində buxarın temperaturudur, K.

İsti kamera üçün, K:

$$T_{B.is} = T_{Or.is} - \Delta T \quad (17)$$

Soyuq kamera üçün, K:

$$T_{B.s} = T_{Or.s} + \Delta T \quad (18)$$

burada ΔT – temperatur polyarizasiyasıdır, isti və soyuq kameralarda axınların nüvəsində ($T_{B.is}$ və $T_{Or.s}$) orta temperaturla membran səthi üzərində olan temperatur fərqini göstərir. Birinci yaxınlaşmada bu göstərici 3÷5$^0$C götürülür və ardıcıl yaxınlaşma ilə dəqiqləşdirilir. Orta temperaturlar kameraların giriş və çıxışlarında qəbul edilmiş temperaturlara əsasən hesablanır, K:

$$T_{Or.is} = 0,5((t_{İs.1}+273)+(t_{S.2}+273)) \quad (19)$$

$$T_{Or.s} = 0,5((t_{İs.p}+273) + (t_{S.p}+273)) \quad (20)$$

Sonuncu düsturda $t_{İs.p}$ və $t_{S.p}$ – soyuq kamerada dövr edən isidilmiş və soyudulmuş permeatın qəbul edilmiş temperaturlarıdır.

Düstur (12 )-də $X_{Su}$ və $a_{Su}$ kəmiyyətləri aşağıdakı kimi hesablana bilər (Rudobashta, Makhmud, 2012: 100-103):

$$X_{Su}= 1 – X_D \quad (21)$$

$$X_D =M/((M_{NaCl} \cdot(1/(10^{-6}\cdot QF\cdot S_{Qid}) –1)+M) \quad (22)$$

$$a_{Su}= 1–0,5\cdot X_D–10\cdot(X_D)^{0,5} \quad (23)$$

burada $X_D$ – MDM-in bəsləyici suyunda duzların kütlə payıdır; $M_{NaCl}$ – NaCl duzunun molyar kütləsidir, q/mol (sadələşdirici şərt kimi qəbul olunur ki, dəniz suyunun bütün duzları onların əsas hissəsini təşkil edən NaCl-dan ibarətdir).

Membran distillə prosesini xarakterizə edən vacib göstəricilərdən biri faydalı iş əmsalıdır – $\eta_{MDM}$, %. Onun hesablanması aşağıdakı düsturla aparılmışdır:

$$\eta_{MDM} = J\cdot H_B\cdot 100/(J\cdot H_B+K_M\cdot(T_{B,is}–T_{B,s})/\delta) \quad (24)$$

burada $H_B$ – membranın orta temperaturunda buxarın entalpiyasıdır, kC/kq; $K_M$ – həmin temperaturda memranın istilikkeçirmə əmsalıdır, kVt/(m·K).

Hesablama modelinin texnoloji hissəsi ilə bərabər GEMD prosesinin bir sıra xüsusi göstəriciləri də maraq doğurur. Onlardan aşağıdakılar hesablanmışdır:

- Günəş kollektorunun xüsusi səthinin sahəsi – $f_{GK,}$ $m^2$/(kq/saat):

$$f_{GK} = F_{GK} / G_Ş \quad (25)$$

- Membranın xüsusi səthinin səhəsi, $f_{M,}$ $m^2$/(kq/saat):

$$f_M = F_M /G_Ş \quad (26)$$

- Şirinləşdirilmiş suyun xüsusi istilik enerji sərfi (1 kq təmiz su almaq üçün tələb olunan günəş enerjisi) – g, kC/kq:

$$g= q/G_Ş \quad (27)$$

- Qidalandırıcı suyun konversiya əmsalı (1 kq qidalandırıcı sudan alınan şirinləşdirilmiş suyun payı) – $KƏ_{Qid}$, %:

$$KƏ_{Qid} = G_Ş \cdot 100/G_{Qid} \quad (28)$$

- MDM-in isti kamerasına daxil olan bəsləyici suyun konversiya əmsalı, $KƏ_{B,}$ %:

$$KƏ_B = G_Ş \cdot 100/G_2 \quad (29)$$

Hesablama modelini komputer simulyasiyası vasitəsi ilə araşdırmaq üçün sistemi xarakterizə edən və idarə olunan giriş dəyişənləri kimi aşağıdakılar qəbul edilmişdir:

- Günəş enerjisinin intensivliyinin sıxlığı – q=300÷900 Vt/$m^2$;
- Günəş kollektorlarının sayi – n=10÷40;
- İD-nin girişində isti suyun temperaturu $t_{İs.1}$= 55÷85 $^0$C;
- MDM-in isti kamerasına daxil olan suyun temperaturu $t_{İs.2}= t_{İs.1} – 5^0$C;
- MDM-in soyuq kamerasını tərk edən permeatın temperaturu $t_{İs.p}=t_{İs2}–10^0$C;
- MDM-in isti kamerasına daxil olan bəsləyici suyun duzluluğu – 60÷120 q/$dm^3$.

Birinci yaxınlaşmada MDM modulunda alınan şirinləşdirilmiş suyun sərfi isti kameraya daxil olan suyun sərfinin 5% bərabər, aralıq konturda İD-yə daxil olan suyun temperaturu isə MDM-dən çıxan suyun temperaturuna bərabər qəbul edilmişdir. Növbəti iterasiyalarla qəbul edilmiş və digər göstəricilərin qiymətləri dəqiqləşdirilmişdir.

**Tədqiqatın nəticələrinin təhlili.**

Təklif edilən texnologiyanın kompüter simulyasiyasını aparmaqdan öncə bir variantın hesablanması aparılmışdır. Onların şərtləri və əsas nəticələri cədvəl 1 və şəkil 2-də gətirilmişdir.

Cədvəldən göründüyü kimi, GK-ların sayı 20 ədəd olduqda, onların cəm səthinin sahəsi 48 $m^2$, qəbul etdiyi enerji 33,3 kVt-a bərabərdir. Giriş faktorlarının qəbul edilmiş digər qiymətlərində günəş enerjisi hesabına MDM-də istehsal olunan distillyatın sərfi 8,45 kq/saat təşkil edir.

Gətirilənlərdən göründüyü kimi, sistemin qidalandırılması üçün duzluluğu 13,7 q/$dm^3$ olan yumşaldılmış dəniz suyu istifadə edilir ki, bu da xam dəniz suyunun duzluluğundan (12,8 q/$dm^3$) 7% artıqdır. Bu fərq codluq ionlarının ekvivalent kütlələrini natrium ionunun ekvivalent kütləsindən daha kiçik olması ilə izah edilir: Ca – 20; Mg – 12; Na – 23. Qidalandırıcı sudan sərfi 8,45 kq/saat

şirinləşdirilmiş suyun alınması birincinin konversiya əmsalının yüksək olmasını göstərir – 86 %. MDM-in bəsləyici suyunun konversiyasına gəldikdə bu göstərici çox kiçik alınır – 5,37 %-i, yəni bəsləyici suyun ancaq göstərilən payı membrandan keçir. Ədəbiyyatda MDM-in bəsləyici suyunun konversiyasının kiçik olması bu prosesin müəyyən xüsusiyyətləri ilə izah olunur. Göstərilir ki, hətta nəzəri halda, bu göstərici 10%-dən artıq olmur (Khalifa, 2017).

**Cədvəl 1.**
**İlkin hesablamaların nəticələri**

| № | Göstəricilər | Ölçü vahidi | Kəmiyyət |
|---|---|---|---|
| 1 | Günəş kollektorların sayı, $N_{GK}$ | Ədəd | 20 |
| 2 | Günəş kollektorlarının (GK) faydalı sahəsi, $F_{GK}$ | $m^2$ | 48 |
| 3 | GK-dən İD-yə daxil olan isti suyun temperaturu, $t_{İs.1}$ | $^0C$ | 85 |
| 4 | İD-dən GK-yə daxil olan suyun temperaturu, $t_{S.1}$ | $^0C$ | 35 |
| 5 | MDM-ə daxil olan suyun temperaturu, $t_{İs.2}$ | $^0C$ | 80 |
| 6 | MDM-i tərk edən suyun temperaturu, $t_{S.2}$ | $^0C$ | 30 |
| 7 | MDM-ə daxil olan bəsləyici suyun duzluluğu, $S_B$ | $q/dm^3$ | 100 |
| 8 | Qidalandırıcı suyun duzluluğu, $S_{Qid}$ | $q/dm^3$ | 13,7 |
| 9 | GK qəbul edən enerji, W | MC | 33,3 |
| 10 | Birinci konturda dövr edən suyun sərfi, $G_1$ | kq/saat | 158 |
| 11 | MDM-in bəsləyici suyunun sərfi, $G_2$ | kq/saat | 155 |
| 12 | Şirinləşdirilmiş suyun (distillyatın) sərfi, $G_Ş$ | kq/saat | 8,45 |
| 13 | Membranın xüsusi səthinin sahəsi, $f_M$ | $m^2$/(kq/saat) | 3,04 |
| 14 | Qidalandırıcı suyun konversiyası, $KƏ_{Qid}$ | % | 86 |
| 15 | MDM-in bəsləyici suyunun konversiyası, $KƏ_B$ | % | 5,37 |
| 16 | MDM-in faydalı iş əmsalı, $\eta_{MDM}$ | % | 58,6 |
| 17 | Günəş enerjisinin xüsusi sərfi, g | MC/kq | 3,93 |

Günəş enerjili membran distillə prosesinin əsas energetik göstəriciləri faydalı iş əmsalı ($\eta_{MDM}$) və günəş enerjisinin xüsusi sərfi (g) hesab olunur. Qəbul edilmiş ilkin şərtlər çərçivəsində faydalı iş əmsalı 58,6% təşkil edir. Bu nəticənin təhlili üçün qeyd etmək lazımdır ki, düstur (24)-ə uyğun olaraq, MDM-in isti kamerasına daxil olan bəsləyici suyun temperaturunun $80^0$C-dən $30^0$C-dək azalması iki paralel proses nəticəsində baş verir: membranın məsamələrindən permeat kamerasına keçən su buxarı molekulları hesabına (istilik-kütlə mübadiləsi) və ancaq istilik ötürmə prosesi hesabına. Baxılan halda istiliyin təxminən 40%-i istilik ötürmə prosesinin payına düşür. Təbiidir ki, bu göstəricini minimuma endirmək məqsədəuyğundur və bu istiqamətdə müxtəlif tədqiqatlar aparılır. Onlardan biri soyuq kamerada permeat əvəzinə hava təbəqəsindən istifadə etməkdir (5).




**Şəkil 2. Hesablamaya aid əsas göstəricilərin işarələri (Cədvəl 1-ə aid)**

Cədvəldən göründüyü kimi, günəş enerjisinin xüsusi sərfi 3,93 MC/kq təşkil edir. Müqayisə üçün qeyd edək ki, üzvi yanacaq istifadə edilən bir pilləli termiki distillə qurğusunda bu göstərici 2,4 MC/kq səviyyəsində olur. Amma üzvi yanacağın istifadəsinin məlum iqtisadi və ekoloji xarakterli bir çox, məlum, çatışmayan cəhəti vardır.

Tədqiq edilən texnologiyanın müxtəlif iş rejimlərinin müqayisəsi baxımından vacib göstəricilərdən biri günəş kollektorunun xüsusi səthinin sahəsidir. Baxılan halda bu göstərici 48/8,45=5,68 $m^2$/(kq/saat) təşkil edir. MDM-də istifadə edilən membrana gəldikdə isə, onun xüsusi səthinin sahəsi 3,04/8,45=0,36 $m^2$/(kq/saat)-dır.

Tədqiqatların əsas hissəsində kompüter simulyasiyası ilə seçilmiş giriş faktolarının çıxış faktorlara təsiri araşdırılmışdır. MDM-in bəsləyici suyunun duzluluğunun təsirini əks etdirən qrafiklər şəkil 3-də verilmişdir. Şəkil 3,a-dan göründüyü kimi, membran moduluna verilən bəsləyici suyun duzluluğu İD və MDM arasında dövr edən suyun sərfinə təsir etmir (1) – 157 kq/saat. Səbəbi GK tərəfindən qəbul edilmiş istiliyin miqdarının və axınların temperaturlarının sabit götürülməsidir.




a)




b)




c)




d)

**Şəkil 3. MDM-in bəsləyici suyunun duzluluğunun çıxış göstəricilərə təsiri qrafikləri: a) Axınların sərflərinə; b) Suyun aktivlik əmsalına və günəş enerjisinin xüsusi sərfinə; c) Konversiya əmsallarına; d) Faydalı iş əmsalına, membranın xüsusi məhsuldarlığına və səthinin sahəsinə;**

**1 – $G_2$; 2 – $G_{Qid}$; 3 – $G_Ş$; 4 – $G_{Üf}$; 5 – $a_{Su}$ ; 6 – g; 7 – $KƏ_{Qid}$; 8 – $KƏ_B$; 9 – J; 10 – $F_M$; 11 – $\eta_{MDM}$; (q=900 Vt; N=20; $t_{is.1}$=85$^0$C; $t_{S.1}$=35$^0$C; $t_{is.2}$=80$^0$C; $t_{S.2}$=30$^0$C; $t_{is.p}$=70$^0$C; $t_{S.p}$=25$^0$C)** .

Həmin qrafikə görə bəsləyici suyun duzluluğunun iki dəfə artması nəticəsində şirinləşdirilmiş suyun sərfi (3) təxminən 14% azalır: 9,2 kq/saat-dan 7,9 kq/saat-dək. Bu azalmanın səbəbini araşdırmaq üçün düstur (12)-yə müraciyət edək. Düsturdan görünür ki, membranın xüsusi

məhsuldarlığı prosesin hərəkətetdirici qüvvəsi ilə (ΔP) düz mütənasibdir. Bəsləyici suyun duzluluğunun artması ΔP-ni azaldır, çünki şəkil 3,b-də göstərildiyi kimi, duzluluq artdıqca membranın isti tərəfində su molekullarının aktivlik əmsalı (5) hiperbolik qanuna yaxın azalır: 0,987-dən 0,973-dək. Həmin qrafikdən o da görünür ki, duzluluğun artması nəticəsində MDM-in məhsuldarlığının azalması günəş enerjisinin xüsusi sərfinin (6) 16% artmasına səbəb olur: 3,62 MC/kq-dan 4,21 MC/kq-dək.

Konversiya əmsalları da bəsləyici suyun duzluluğundan asılı olaraq dəyişir (Şək.3,c): qidalandırıcı suya görə (7) – 77%-dən 89%-dək artır, çünki duzluluq artdıqca üflənən suyun sərfi azalır. Bəsləyici suya görə konversiya əmsalının (8) – 5,86%-dən 5,02%-dək azalması membran prosesinin yuxarıda qeyd olunan məlum xüsusiyyətlərindən irəli gəlir.

Şəkil 3,c-dən göründüyü kimi bəsləyici suyun duzluluğunun artması membranın xüsusi məhsuldarlığını (9) 12,7 kq/($m^2$·saat)-dan 8,5 kq/($m^2$·saat)-dək azaldır. Çünki duzluluq artdıqca prosesin hərəkətetdirici güvvəsi azalır. Düstur (11)-də göstərilən membran səthinin sahəsi ilə onun xüsusi məhsuldarlığı arasında tərs mütənasib asılılığa əsaslansaq, tələb olunan membran səthinin (10) artması gözləniləndir. Membran distillə prosesinin f.i.ə.-də azalır: 63,8%-dən 54,8%-dək (11). Bunun səbəbi su molekullarının aktivlik əmsalının azalmasındadır. Bu göstərici azaldıqca buxar şəklində membrandan keçən istiliyin payı azalır.

Eyni şərtlərdə günəş kollektorlarının sayının əsas çıxış göstəricilərə təsiri haqqında məlumatı şəkil 4-də gətirilən qrafiklərdən almaq olar.

Şəkil 4,a-dan göründüyü kimi, GK-ların sayının 10÷40 ədəd arasında artırılması nəticəsində sistem qəbul etdiyi günəş enerjisinin miqdarı (1) xətti qanuna uyğun olaraq 16,6 MC-dan 66,4 MC-dək, yəni 4 dəfə artır. Uyğun olaraq günəş enerjisi qəbul edən səthin sahəsi (2), eləcə də hər iki konturda dövr edən suyun sərfi artır. Məsələn, birinci konturda dövr edən suyun (istilikdaşıyıcının) sərfi (3) 80 kq/saat-dan 320 kq/saata çatır. Təbiidir ki, qəbul edilmiş enerjinin artması MDM-də alınan şirinləşdirilmiş suyun sərfinin (4) və tələb olunan membran səthinin sahəsinin (5) artmasına səbəb olur: uyğun olaraq, 17 kq/saat-dək və 6 $m^2$-dək.

MDM-nin texnoloji göstəricilərinə təsir edən vacib giriş faktorlardan biri modula verilən bəsləyici (şirinləşdirilən) suyun temperaturudur – $t_{İs.2}$. Bu faktorun 50÷80$^0$C dəyişmə həddində təsirinin tədqiqində isinmiş permeatın temperaturu ($t_{İs.p}$) bəsləyici suyun temperaturundan 10$^0$C kiçik, GK-ların sayı 20 ədəd görürülmüşdür. Kompüter simulyasiyasının əsas nəticələri şəkil 5-də verilir.




**Şəkil 4. Günəş kollektorlarının sayının əsas çıxış göstəricilərə təsiri qrafikləri: a) günəş enerjisinin miqdarına (1), kollektorların cəm səthinin sahəsinə (2) və birinci konturda dövr edən suyun sərfinə (3); b) şirinləşdirilmiş suyun sərfinə (4) və membran səthinin sahəsinə (5).**

Bəsləyici suyun temperaturunun artırılması ikinci konturda dövr edən suyun sərfini (1) azaldır (Şək. 5,a). Belə asılılıq istilik balansından irəli gəlir: günəş kollektorlarının sayı sabit götürüldüyü üçün ikinci kontura eyni miqdarda istilik ötürülür. Şirinləşdirilmiş suyun sərfinin (2) artması nüfuz etmə əmsalının (3) və membranın xüsusi məhsuldarlığının (4) artması ilə izah olunur (Şək. 5,b). Öz növbəsində son iki göstəricinin artmasına səbəb membran səthinin orta temperaturunun (5) artmasıdır (Şək. 5,c). Beləliklə, MDM-in axınlarının digər temperaturlarının sabit qalmaqla ancaq bəsləyici suyun temperaturunun artırılması membranın orta temperaturunu yüksəldir. Nəticədə, düstur (13)-dən göründüyü kimi, nüfuz etmə əmsalı və ondan asılı olan membranın xüsusi məhsuldarlığı artır. Belə təsirin daha bir nəticəsi membran distillə prosesinin f.i.ə.-nin (6) artmasıdır: 48%-dən 59%-dək.

Bəsləyici suyun temperaturunun artması xüsusi istilik mübadilə səthlərinin sahələrinin və günəş enerjisinin xüsusi sərfini azaldır (Şək. 5,c.7,8,9): günəş kollektorunun xüsusi səthinin sahəsi 8÷5,2 $m^2$/(kq·saat), günəş enerjisinin xüsusi sərfi 6÷3,9 MC/kq, membranın xüsusi səthinin sahəsi 0,7÷0,35 $m^2$/(kq·saat) hədlərində. Göründüyü kimi, ümumi prosesin məhdudlaşdırma mərhələsi günəş kollektorlarının payına düşür: orta hesabla 1$m^2$ membran səthinin sahəsinə 9,4 $m^2$ günəş kollektorun sahəsi düşür. Odur ki, prosesin səmərəliliyinin artırılması üçün, ilk növbədə, f.i.ə-i daha yüksək olan günəş kollektorlarından istifadə edilməlidir.




a)




b)




c)




d)

**Şəkil. 5. MDM-in bəsləyici suyunun temperaturunun əsas çıxış göstəricilərə təsiri: a) Bəsləyici suyun (1) və qidalandırıcı suyun (2) sərfinə; b) Membranın keçicilik əmsalına (3) və xüsusi məhsuldarlığına (4); c) Membranın orta temperaturuna (5) və f.i.ə.-sinə (6); d) Membranın xüsusi səthinə (7), günəş enerjisinin xüsusi sərfinə (8) və günəş kollektorun xüsusi səthinə (9).**

Yuxarıda gətirilən nəticələrdə günəş enerjisinin intensivliyi sabit götürülmüşdür (900 Vt). Belə intensivlik yay aylarında günün ən isti saatlarında müşahidə olunur. Digər zamanlarda günəş enerjisinin intensivliyi daha kiçik olur. Bununla əlaqədar q=300 və 600 Vt üçün də hesablamalar aparılmışdır. Bu hesablamalarda qəbul edilmişdir ki, q=300 Vt intensivlikdə MDM-in bəsləyici

suyunun maksimal temperaturu $40^0$C, q=600 Vt olduqda – $60^0$C təşkil edə bilər. Müvafiq hesablamalarda GK-ların sayı 20 ədəd, MDM-in bəsləyici suyu ilə isidilmiş permeatın temperaturlar fərqi $10^0$C qəbul edilmişdir. Digər ilkin şərtlər dəyişdirilməmişdir.

Hesablamalardan görünür ki, qəbul edilmiş günəş enerjisinin sabit qiymətində hər iki konturda dövr edən suyun sərfi sabit qalır: q-un 300 və 600 Vt qiymətləri üçün ikinci konturda dövr edən suyun sərfi, uyğun olaraq 525 kq/saat və 175 kq/saat təşkil edir. Alınan digər nəticələr cədvəl 2-də verilir.

**Cədvəl 2.**
**Günəş enerjisinin intensivliyinin və MDM-in bəsləyici suyunun duzluluğunun əsas texnoloji göstəricilərə təsiri**

| $S_B$, q/l | J, kq/(m$^2$saat) | $G_Ş$,kq/saat | $f_{GK}$ m$^2$/ (kq/saat) | $f_M$ m$^2$/ (kq/saat) | $\eta_{MDM}$, % | g, MC/kq |
|---|---|---|---|---|---|---|
| 60 | $\frac{4,64}{8,03}$ | $\frac{3,89}{5,12}$ | $\frac{12,3}{9,4}$ | $\frac{0,77}{0,44}$ | $\frac{41,5}{53,2}$ | $\frac{5,72}{4,39}$ |
| 80 | $\frac{4,22}{7,26}$ | $\frac{3,68}{4,85}$ | $\frac{13,0}{9,9}$ | $\frac{0,86}{0,50}$ | $\frac{39,3}{51,3}$ | $\frac{6,03}{4,57}$ |
| 100 | $\frac{3,72}{6,43}$ | $\frac{3,42}{4,57}$ | $\frac{14,0}{10,5}$ | $\frac{0,97}{0,56}$ | $\frac{36,6}{48,2}$ | $\frac{6,48}{4,85}$ |
| 120 | $\frac{3,21}{5,54}$ | $\frac{3,16}{4,24}$ | $\frac{15,2}{11,3}$ | $\frac{1,12}{0,65}$ | $\frac{33,8}{45,3}$ | $\frac{7,02}{5,23}$ |

*Qeyd: Sütət – q=300 Vt; Məxrəc – q =600 Vt*

Alınan nəticələrin təhlili göstərir ki, günəş enerjisinin intensivliyinin artması membranın xüsusi məhsuldarlığını (J) və şirinləşdirilmiş suyun sərfini ($G_Ş$), uyğun olaraq, 1,7 və 1,3 dəfə artırır. Bəsləyici suyun duzluluğunun artması isə hər iki göstəricinin azalmasına səbəb olur: uyğun olaraq, 45% və 23%. Bu təsirin mexanizmi yuxarıda izah olunmuşdur. Membranın nüfuz etmə əmsalı ($B_M$) praktiki olaraq duzluluqdan asılı deyil. Günəş enerjisinin intensivliyinin yüksəlməsi isə bu göstəricini çox kiçik həddə artırır: təxminən 2,3%. Az da olsa bu artmanın səbəbi, bəsləyici suyun temperaturu ilə korrelyasiya olunan, membran səthinin orta temperaturunun yüksəlməsi ilə izah olunur.

Alınan nəticələrdən görünür ki, hər iki giriş faktorunun artması membranın xüsusi səthinin sahəsini ($f_M$) artırır. Bunun səbəbi $f_M$ və J arasında tərs mütənasib asılılıqla izah olunur. Göründüyü kimi, membranın xüsusi səthinin sahəsi 0,44÷1,12 m$^2$/(kq/saat) həddində dəyişir: q artdıqca, orta hesabla, 43% azalır; $S_B$ artdıqca – 45% artır. Günəş kollektorun xüsusi səthinin sahəsi ($f_{GK}$) daha yüksək alınır: 9,4÷15,2 m$^2$/(kq/saat); q artıqca, orta hesabla 20 % azalır, $S_B$ artdıqca – 24% artır.

Hesablamalara görə membran distillə prosesinin f.i.ə.-nin ($\eta_{MDM}$) 33,8÷53,2% həddində azalması gözlənilir. Bu göstəriciyə q-nun təsiri daha böyükdür və $S_B$-in səviyyəsindən asılı olaraq 22÷26% təşkil edir. Bəsləyici suyun duzluluğunun təsiri 15÷19%-lə qiymətləndirilir. Cədvəlin sonuncu sütununda göstərildiyi kimi, q-nun artması xüsusi enerji sərfini (g) təxminən 24% azaldır, $S_B$-in artması isə bu göstəricini 17% artırır.

Qeyd etmək lazımdır ki, gətirilmiş hesablama metodikası əsasında bir sıra digər praktiki əhəmiyyətli məsələlər də həll edilə bilər. O cümlədən, yerli şəraitə uyğun olaraq və istilik akkumulyatorunun istifadəsi ilə sistemin orta sutkalıq, orta aylıq məhsuldarlığının hesablanması, optimallaşdırma məsələlərinin həlli və digərləri.

## Nəticə

Xəzər dənizi sahilində yerləşən ölkələrin şirin su çatışmazlığı probleminin həlli üçün günəş enerjili membran distillə texnologiyasının istifadəsi böyük maraq doğurur. Çünki bu texnologiya enerji qənaətlidir, ekoloji baxımdan təmizdir və qalıq duzluluğu çox kiçik olan (10 mq/dm$^3$-dək) təmiz su almağa imkan verir. "Gelman" şirkətinin birbaşa kontaktlı membran distillə modulunun,

"Buderus SKN 4.0" markalı günəş kollektorlarının və ərpin qarşısını almaq üçün dəniz suyunun Na-kationlaşdırma üsulunun istifadəsinə əsaslanan müvafiq texnologiyanın prinsipial sxemi və hesablama modeli işlənilmişdir. Modelin kompüter simulyasiyası ilə günəş enerjisinin intensivliyinin, kollektorların sayının (səthinin sahəsinin), membran modulunun bəsləyici suyunun duzluluğunun, temperaturunun və digər giriş göstəricilərin dəniz suyunun şirinləşdirmə prosesinin texnoloji göstəricilər toplusuna təsiri öyrənilmişdir. Müəyyən edilmişdir ki, günəş intensivliyinin səviyyəsindən (300÷900 $Vt/m^2$) asılı olaraq, tələb olunan günəş kollektorunun xüsusi səthinin sahəsi 9,4÷15,2 $m^2$/(kq/saat) həddində dəyişir və intensivlik artdıqca səth azalır. Qəbul edilmiş digər ilkin şərtlər çərçivəsində, membranın xüsusi səthinin sahəsi isə 0,36÷1,12 $m^2$/(kq/saat) həddində dəyişir. Günəş enerjisinin intensivliyinin, eləcə də MDM-nin bəsləyici suyunun duzluluğunun artması (60÷120 $q/dm^3$) bu göstəricinin qiymətini artırır.

Alınan nəticələrə görə, ilkin şərtlərdən asılı olaraq, günəş enerjisinin xüsusi sərfi 3,6÷7,0 MC/kq həddində dəyişir. Günəş enerjisinin intensivliyinin və MDM-in bəsləyici suyunun temperaturunun artması (50÷$80^0$C) xüsusi enerji sərfini azaldır, bu suyun duzluluğunun artması isə xüsusi enerji sərfini artırır.

Hesab edirik ki, gətirilmiş günəş enerjili membran distillə texnologiyasının tədqiqi üçün təklif edilən model əsasında, istənilən müxtəlif digər şərtləri də nəzərə alaraq, lazımi hesablamalar aparıla bilər. Xəzər dənizi suyu əvəzinə hər hansı bir duzlu su mənbəyi istifadə oluna bilər: yeraltı şoran suları, torpaqların yuma (drenaj) suları və s.

Gələcək tədqiqatların əsas istiqamətləri kimi aşağıdakıları hesab edirik: texniki-iqtisadi səmərəliliyin qiymətləndirilməsi, optimallaşdırma məsələlərinin həlli, birbaşa kontaktlı MDM-in başqa növ MDM-lərlə (hava təbəqəli, vakuumlu və s.) müqayisəsi.

Duzlu suların günəş enerjili membran distillə qurğularının dəniz sahillərində, yaşayış məntəqələrindən və ənənəvi enerji mənbələrindən uzaqda yerləşən müxtəlif təsərrüfatlarda kiçik həcmlərdə təmiz su almaq üçün istifadə edilməsi təklif olunur.

## Ədəbiyyat

1. Curto, D., Franzitta, V., Guercio, A.A. (2021). Review of the Water Desalination Technologies. Appl. Sci. 11. 670. https://doi.org/ 10.3390/app11020670
2. Furqan Tahir at al. (2020). Resilience of Desalination Plants for Sustainable Water Supply in Middle East. In book: Sustainability Perspectives: Science, Policy and Practice, p.303-329.
3. Antonio Zapata-Sierra at al. (2021). Worldwide research trends on desalination. Desalination, V.519, 115305.
4. Peter, G. at al. (2015). Seawater desalination technologies. International Journal of Innovation Sciences and Research Vol.4, No 8, p.402-422.
5. Enrico Drioli at al. (2015). Membrane distillation: Recent developments and perspectives. Desalination 356, p.56-84.
6. Daniel Gonzalez at al. (2017). Membrane distillation: Perspectives for sustainable and improved. Desalin. Renewable and Sustainable Energy Reviews 80, p.238-259.
7. Ruh Ullah, I., Rasul, M.G. (2019). Recent developments in solar thermal desalination technologies: A review. Energies 12, p.119
8. Ruh Ullah, I. at al. (2018). Energy efficiency of direct contact membrane distillation. Desalination 433, p.56-67.
9. Imran Hussain Moidu, Hariharan R. (2015). Design, Fabrication and Performance Analysis of Direct Contact Membrane Type Distillation System Integrated With Solar Flat Plate Collector. International Journal of Emerging Engineering Research and Technology, Volume 3, Issue 8, p.177-188.
10. Kawtar Rahaoui et al. (2017). Sustainable membrane distillation coupled with solar pond. Energy Procedia 110, p.414-419.
11. Chen, Y.H. at al. (2021). Economic Design of Solar-Driven Membrane Distillation Systems for Desalination. Membranes, p.15.

12. Christie, K.S.S. et al. (2022). Gypsum scaling in membrane distillation: Impacts of temperature and vapor flux. Desalination 525, 115499.
13. Gryta, M. (2008). Alkaline scaling in the membrane distillation process. Desalination 228(1), p.128-134.
14. Sergio, G., Salinas-Rodriguez et al. (2021). Seawater Reverse Osmosis Desalination. Assessment and Pre-treatment of Fouling and Scaling. IWA PABLISHING, London, p.301.
15. http://net 220.ru/poleznye_stat/solnechnaya_radiaciya_tablicy_incolyacii/
16. Zantaporn Waritha et al. (2017). Specific energy requirement of direct contact membrane distillation. Chemical Engineering Research and Design 128, p.15-26, ISSN 0263-8762.
17. Ashraf Al-Ashhab at al. (2022). Antiscalants Used in Seawater Desalination: Biodegradability and Effects on Microbial Diversity. Microorganisms, 10, 1580.
18. Konstantin Popov et al. (2016). A Comparative Performance Evaluation of Some Novel (Green) and Traditional Antiscalants in Calcium Sulfate Scaling. Advances in Materials Science and Engineering, p.1-10.
19. Feyziyev, K.K. (2009). Vysokoeffektivnyye metody umykcheniya i obessolivaniya vody. izd. 2, Bakinskaya TES «Takhsil», s.442.
20. http://solarb.ru/raschet-solnechnogo-kollektora-dlya-gvs
21. Rudobashta, S.P., Makhmud, S.Yu. (2012). Matematicheskoye modelirovaniye protsessa membrannoy distillyatsii. Khimiya i khimicheskaya promyshlennost. T.55, s.100-103.
22. Khalifa, A. et al. (2017). Experimental and theoretical investigation on water desalination using direct contact membrane distillation. Desalination.Vol.404, p.22-34.
23. Weiming, Ni., Yongli, Li. et al. (2020). Simulation Study on Direct Contact Membrane Distillation Modules for High-Concentration NaCl Solution. Membranes (Basel). Aug, 10(8), p.179.

Göndərildi: 29.10.2022 Qəbul edildi: 19.01.2023

DOI: https://doi.org/10.36719/2663-4619/87/103-108

**Munis Ağabəy oğlu Əsədli**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
asadli.munis@gmail.com

# KÜLƏK ENERJİSİNİN DAĞLIQ ŞİRVAN İQTİSADİ ZONASINDA ENERGETİK XÜSUSİYYƏTLƏRİNİN TƏDQİQİ

**Xülasə**

Məqalədə Azərbaycan Respublikasında bərpa olunan enerjinin tarixi, inkişafı və statistikası haqqında məlumat verilmişdir. Eyni zamanda Dağlıq Şirvan iqtisadi zonasında bərpa olunan enerjinin bir növü olan, külək enerjisinin potensialı, ərazinin iqtisadi və coğrafi mövqeyi haqqında məlumatlar vardır. Dağlıq Şirvan iqtisadi zonasında mövcud olan külək elektrik stansiyaları və külək enerjisindən istifadəsinə dair məlumatlar da verilmişdir. Külək enerjisindən həm Dağlıq Şirvan iqtisadi ərazisində, həm də respublikanın digər ərazilərində istifadəsi və səmərəliliyi haqqında məlumatlar da vardır. Respublikanın hansı zonalarında külək enerjisinin yüksək potensiala sahib olması və istifadə sahəsində səmərəliliyin artırılmasına dair təkliflər təqdim olunmuşdur.

***Açar sözlər:*** *külək enerjisi, külək turbiləri, inventorlar, qüllə, pər*

**Munis Aghabay Asadli**
Azerbaijan State Oil and Industry University
master student
asadli.munis@gmail.com

## Study of energetic properties of wind energy in Mountainous Shirvan economic zone

**Abstract**

The article provides information on the history, development and statistics of renewable energy in the Republic of Azerbaijan. At the same time, there is information about the potential of wind energy, which is a type of renewable energy, and the economic and geographical position of the area in Mountainous Shirvan economic zone. Information on wind power plants and the use of wind energy in the Mountainous Shirvan economic zone is also provided. There is information about the use and efficiency of wind energy both in the economic area of Mountainous Shirvan and in other areas of the Republic. In which areas of the republic wind energy has a high potential and suggestions for increasing the efficiency in the field of use have been made.

***Keywords:*** *wind energy, wind turbines, inventors, tower, par*

## Giriş

Bərpa olunan enerjini (təbiətdən təbii şəkildə əldə edilə bilən və özünü bərpa edən bir enerji mənbələridir) yaşıl enerji olaraq adlandırmaq olar. Bununla yanaşı, bərpa olunan enerji növləri təbiətə zərər verən karbon qazının və digər kimyəvi tullantıların azaldılması baxımından çox üstündür. Eyni zamanda təbii mənbələr olduqları üçün idxal edilməyə ehtiyac duyulmur. Bu da enerji məsələsində xaricdən asılılığın minimallaşdırılması kimi bəzi məqamlarda olduqca əhəmiyyətlidir.

Yaşıl enerji mənbələrinin ənənəvi enerji mənbələrindən fərqləndirən üç əsas növü bunlardır:

1. Bərpa olunan enerji mənbələri tükənməzdir;
2. Bərpa olunan enerji mənbələri tam təhlükəsiz, iqlim üçün heç bir zərəri yoxdur;
3. Bərpa olunan enerji mənbələri yerli və təbii mənbələrdir.

Bərpa olunan enerji mənbələrinin dünya üzrə istifadəsinə nəzər etsək, xüsusən də inkişaf etmiş ölkələrdə istifadənin artımını aşkar şəkildə görərik. ABŞ, Çin, Yaponiya və Avropa Birliyinə üzv olan ölkələrdə və iqtisadi cəhətdən sürətlə inkişaf edən bir çox dövlətlərdə bu sahədə ciddi işlərin aparıldığı və enerji təhlükəsizliyinin təmin edilməsində yaşıl enerji növlərindən istifadənin yüksək olduğunu görərik. Beynəlxalq Enerji Agentliyinin hesabatlarına nəzər etsək, bu sahəyə ciddi və yüksək miqdarda investisiya qoyuluşunu açıq-aşkar görərik, bu da qlobal enerji sistemində bərpa olunan enerji mənbələrinin payının gündən-günə sürətlə artımı deməkdir.

Hər kəsin bildiyi kimi, ölkəmizdə neft-qaz ehtiyatları çoxdur. Statistikaya əsasən, neft və qaz ehtiyatımız hələ bundan sonra uzun illər daxili tələbatımızı ödəməyə və xaricə satmağa imkan verəcək qədər çoxdur. Yaşıl enerji mənbələrindən istifadə ölkəmizdə istehsal olunan enerjinin potensialını daha da yüksəldir.

Külək havanın üfiqi istiqamətdə hərəkətidir. Başqa cür desək, atmosferin aşağı qatlarında, yer səthinə yaxın yerdə havanın hərəkətidir. Küləyin hərəkəti nəticəsində istilik və rütubət bir yerdən digər yerə daşınır. Bəs külək necə yaranır? Barik qradiyentin təsiri altında külək təzyiq yüksək olan sahədən aşağı olan sahəyə doğru hərəkət edir. Bu atmosfer təzyiqinin müxtəlif ərazilərdə müxtəlif olmasından irəli gəlir, istiqamət və sürəti ilə səciyyələnir. Bəs bu təzyiqlər fərqi necə yaranır? Bunun səbəbi belə izah olunur: Günəş şüalarının dünyanın müxtəlif yerlərinə fərqli miqdarda istilik ötürməsidir. Belə ki, bu vəziyyətdə hava kütəsi bəzi ərazilərdə çox, bəzi ərazilərdə isə az qızır. Məlumdur ki, hər bir maddə qızarkən genişlənir, soyuduqca isə sıxılır. Hava da isindikcə genişlənir və eyni həcmdə olan soyuq hava kütləsindən az olur və yuxarı qalxır. Başqa sözlə, isti hava soyuq havadan yüngül olduğu üçün havada basqı yaranır. İsti hava yüngül olduğundan yuxarı qalxdıqca onun yerinə soyuq hava keçir. Bu da küləyin yaranmasına səbəb olur. İki ərazi arasında temperatur fərqi nə qədər çox olarsa, təzyiqlər fərqi də çox olur. Bu da küləyin sürətinə təsir edir.
Külələri əsdiyi cəhətin adı ilə adlandırırlar. Ümumilikdə isə küləyin növündən aslı olmayaraq gücü və istiqaməti flüger adlanan cihazla ölçülür. Küləyin sürətini (m/san və ya km/saat) anemometrlə ölçürlər. Küləyin gücü isə sürəti ilə düz mütənasibdir. Küləyin gücünü isə 12 ballıq Bofort şkalası ilə ölçürlər (Yusifbayli, Nasibov 2016).

Külək enerjisi Günəşin təsiri nəticəsində yarandığı üçün o da bərpa olunan enerjinin bir növüdür. Külək enerjisinin ümumi Yer kürəsindəki miqdarı bütün çayların enerjisindən 100 dəfədən də çoxdur. Külək enerjisi sürətinin kubu ilə düz mütənasibdir. Lakin külək enerjisinin bu qədər çox olmasına baxmayaraq, biz bundan tam faydalana bilmirik. Hesablamalara görə, külək enerjisindən faydalı istifadə miqdarı 59.3% təşkil edir. Biz bunun müəyyən bir hissəsini istifadə edə bilirik. Ən müasir külək qurğularının belə faydalı iş əmsalı 50% civarındadır.

Külək enerjisinin ta qədim zamanlarda ilk olaraq mexaniki enerjiyə çevirərək istifadə ediblər. Külək enerjisinin mexaniki enerjiyə çevrilməsinin çox qədim tarixi vardır. Bizim eradan əvvəl İranda taxıl döymək üçün şaquli oxlu külək mühərrikləri yaradılmışdır. Zaman keçdikcə bu mühərriklər Yaxın Şərq ölkələrinə də yayılmağa başladı. Avropada isə bu cür mühərriklər X əsrdə Səlib yürüşündən sonra yayılmağa başladı. Bu cür mühərriklərin istifadəsində Hollandiya XIV əsrdə Avropada birinci yerdə idi (2).

Elm və texnika inkişaf etdikcə küək enerjisinin digər enerji növlərinə keçməsi lazım oldu. Müasir texnikada külək enerjisindən daha çox elektrik enerjisinin istehsalında istifadə olunur. Çünki elektrik enerjisi universal enerji olduğundan, digər enerji növlərinə asanlıqla keçə bilir. Hazırda dünyanın çox ölkəsində küləkdən enerji istehsal etmək üçün külək elektrik stansiyaları quraşdırılmışdır. Külək elektrik stansiyalarında külək çarxları küləkdən gələn mexaniki enerjini elektrik enerjisinə çevirmək üçün elektrik generatorlarına qoşulur. Məlum olduğu kimi, küləyin istiqaməti, sürəti və gücü dəyişkəndir. Ona görə də küləyin sürətindən aslı olaraq istehsal olunan enerjinin miqdarı müxtəlif olur. Bu səbəbdən enerjini vaxtdan aslı olaraq müntəzəmləşdirmək üçün elektrik akkumlyatorlarından istifadə olunur.
Külək elektrik stansiyalarının tikintisi zamanı bəzi nüanslara diqqət edilməlidir:
1. Küləyin mövcudluğu;
2. Tikinti üçün torpağın uyğun olması;

3. Sahədən istifadənin əlçatan olması;
4. Elektrik xətlərinə girişin olması;
5. Ekoloji təsirlər.

Külək enerjisini sabit cərəyana çevirən stansiyaların gücü çox vaxt 0.4-3 kVt arasında dəyişir. Bu enerji bizə elektrik akkumlyatorlarının doldurumasında, fermaların və kiçik binaların işıqlandırılmasında istifadə olunur. Bu növ eletrik stansiyaları adətən digər stansiyalarla paralel işlədilir. Bu növ stansiyaların çatışmayan cəhətləri elektriki uzaq məsafəyə ötürə bilməməsi və batareyalardan səmərəli istifadəyə imkan verməməsidir. Dəyişən cərəyan istehsal edən külək elektrik stansiyalarında bu növ çatışmazlıqlar olmadığından onlar daha əlverişli və daha çox yayılmışdır. Həmçinin dəyişən cərəyanlı Külək ES-lərdə asinxron mühərriklərdən istifadə olunduğu üçün daha ucuz və konstruksiyası sadədir. Elektrik gücünə görə Külək ES-lərin üç növü vardır (3):

1. Gücü 0.1-10 kVt olan kiçik ES-lər;
2. Gücü 10-100 kVt olan orta güclü ES-lər;
3. Gücü 100 kVt və daha çox olan güclü Es-lər.

Külək enerjisi dünya üçün çox əhəmiyyətlidir. Dünyanın demək olar ki, hər yerində külək enerjisindən istifadə olunur. Dünya üzrə statistikaya nəzər saldıqda, 2020-ci ildə külək enerjisindən istifadə 733 GVT olduğunu görərik.

Dünya üzərində külək enerjisinin 2010-cu ilədək ən çox istifadəçisi Çin və Hindistan idi. Elm və texnika inkişaf etdikcə bu siyahıya Şimali Amerika və Avropa da daxil olundu. Çində sadəcə 2015-ci ildə istehsal olunan külək enerisinin ümumi miqdarı 145 GVT olmuşdur. Həmin ildə Çində istehsal olunan enerji dünyada istehsal olunan ümumi külək enerjisinin yarısını təşkil ediridi. 2020-ci ildə Danimarkada külək enerjisi 56%, Uruqvayda 40%, Litvada 36%, İrlandiyada 35%, Böyük Britaniyada 24%, Portuqaliya və Almaniyada 23%, İsveçrədə 16%, ABŞ-da 8%, Çində isə 6% təşkil edirdi.

2018-ci ildə dünyada istehsal olunan ümumi enerjinin 4.8%-i külək enerjisinin payına düşürdü. Bu göstərici 4 il əvvəlində 3.1% idi. Həmin ildə Avropada külək enerjisinin istehsalının miqdarı 18.8% olmuşdur. Yaxın Şərq, Latın Amerikası və Afrikada külək enerjisinin istehsalı 8%-dən 10%-dək artmışdır.

Azərbaycan da bərpa olunan enerji mənbələri üzrə yüksək potensiala sahibdir. Ölkəmizdə bərpa olunan enerji mənbələrinin potensialı 27000 MVt təşkil edir. O cümlədən külək enerjisinin potensialı 3000 MVt təşkil edir. Bu sahədə görülən işlərdən biri də 2020-ci il 22 sentyabrda Azərbaycan Respublikasının Prezidentinin 1159 nömrəli fərmanı olmuşdur. Azərbaycanda Energetika Nazirliyinin yanında Bərpa Olunan Eneri Mənbələri Agentliyi yaradılmışdır.

Azərbaycanda bərpa olunan enerji üzrə hidro enerji 1158.8 MVT (30 stansiya 20 kiçik su elektrik stansiyası), külək enerjisi 66.1 MVt (7 stansiya 2-i hibrid), bioenerji 37.7 MVt (2 stansiya 1-i hibrid), Günəş enerjisi 45.9 MVt (12 stansiya 2-i hibrid) təşkil edir. Hibrid stansiyalardan 1-i Qobustanda külək enerjisi 2.7 MVt, günəş 3MVt və bioenerji 0.7 MVt olaraq əsaslı qurğular quraşdırılmışdır (Məmmədov, 2003).

2021-ci ilin ölkəmiz üzrə statistikasına nəzər salsaq, istehsal olunan enerjinin 27.8 milyard kVt/saat təşkil etdiyini görərik. Burada İES-lərin payı 26.2 milyard kVt/saat SES-lərdə 1277.3 milyon kVt/saat təşkil edir. Yerdə qalan 339.9 milyon kVt/saat enerji isə külək, günəş və bioenerjinin payına düşür. İl ərzində istehsal olunan enerjinin 91.5 milyon kVt/saat, külək enerjisinin 55.2 milyon kVt/saat, Günəş enerjisinin 193.2 milyon kVt/saat, enerji isə bioenerjinin (bərk məişət tullantılarının yandırılması) payına düşür. Azərbaycanda bərpa olunan enerji ümumi istehsal olunan enerjinin 5.8%-ni təşkil edir ( Bədəlov, Kəlbiyev, 2014).

Azərbaycanda bərpa olunan enerjinin inkişafı və yüksək potensiala sahib olan 8 ərazi seçilmişdir. Seçilmiş ərazilərdən 3-ü pilot layihəsi üzrə həyata keçirilmə ilə bağlı tədbirlər görülür. Azərbaycanda olan üçpilləli Enerji İnkişafı modeli layihəsinin tərkib hissələrindən biri olan “ev-1” elektrostansiya prinsipi çərçivəsində ABOEM texnologiyaları istifadə etməklə yaşayış və qeyri-yaşayış məntəqələrinin enerji təchizatı günəş, külək, geotermal və bioenerji hesabına hibrid formalı

elektrik stansiyaları prinsipi daxilində yaşayış yerlərində yerli enerji mənbələri hesabına enerji təchizatının formalaşdırılması özünü göstərir.

Samux Aqroenerji Yaşayış Kompleksinin 50 mindən çox əhalisi olan yaşayış sahəsində hibrid formalı stansiyalarda istehsal olunan enerji, buradakı enerji təchizatının təmin olunması eksperimental poliqondur. Bu da təcrübənin digər rayonlarda tətbiqinin, xüsusən enerji təchizatının zəif olduğu bölgələrin enerji təchizatı üçün geniş şərait yaratması müsbət qarşılanır (6).

Ənənəvi ehtiyatların azalması və bu ehtiyatların bərpa olunmaması, eləcə də yanacaq növlərinin qiymətlərinin dəyişkən olması, neft və qaz kimi ehtiyatların ölkələrdə istifadəsinin ekoloji tarazlığın pozulmasında mühüm rol oynaması artıq böyük problemdir. Bu da günü-gündən bərpa olunan enerji mənbələrinə ehtiyacın artmasına səbəb olur.

Azərbaycan külək enerjisindən istifadəyə görə çox əlverişli mühitə sahibdir. Xəzər sahili ərazilərdə külək potensialı çox yüksəkdir. Xüsusilə Bakı, Sumqayıt, Abşeron, Binə, Maştağa və s. ərazilərdə külək potensialı yüksək olduğu üçün istifadəsi daha məqsədəuyğundur. Azərbaycanda küləyin rejimi çox mürəkkəbdir. Bunun səbəbi ölkə ərazisinin 60%-nin dağlıq zonalardan ibarət olması ilə əlaqədardır (7).

Ölkəmizin şərq bölgərində ən çox şimal-şərq, şimal-qərb külələri əsir. Bu ərazilərdə şimal küləyinin illik orta sürəti 6-10 m/san-ə çatır. Bu zonalarda küləyin 25%-nin sürəti 11-15 m/san civarındadır. Ölkəmizdə fyon küləkləri də olur ki, bu zaman temperaturun kəskin artması müşahidə olunur. Dağlıq ərazilərimizdə fyon küləkləri əsən zaman qar sürətlə əriyir. Bundan əlavə olaraq ilin isti dövrlərində dağlıq ərazilərdə gecə-gündüz istiqaməti dəyişən dağ-dərə küləkləri də olur (8).

Azərbaycan Respublikasının iqliminə dağların və dağlıq zonaların təsiri böyükdür. Bunu başqa cür izah etsək, Böyük Qafqaz dağları sədd rolunu oyanayaraq şimal-şərqdən soyuq hava kütəsinin əraziyə daxil olmasına təsir edir. Bu da soyuq hava kütəsinin Qafqaz dağlarını keçərək ölkəyə Abşeron yarmadasından daxil olmasına səbəb olur. Bunun nəticəsidir ki, Zaqatala küləyinin orta illik sürəti 1.2 m/san olur. Abşeron yarmadasında isə bu göstərici 8.6 m/san-dir.

Azərbaycan Respublikası coğrafi mövqeyinə və iqlim şəraitinə görə alternativ enerji mənbələrindən istifadə üçün əlverişli imkanlara malik olan ölkələrdən biridir. Ölkədə çayların, günəşin, küləyin, yeraltı isti (geotermal) suların və biokütlənin enerjisindən istifadənin geniş imkanları vardır.

Azərbaycanda külək və günəş enerjisindən istifadə etmək üçün çox əlverişli iqlim şəraiti vardır. Aparılmış tədqiqatlar göstərir ki, külək enerjisinin istifadə gücünü 800 MVt-a çatdırmaq mümkündür. Külək enerjisindən istifadə etməklə ildə 4 mlrd. kVt-saat elektrik enerjisi istehsal etmək mümkün olarsa, ildə 1 mln. ton şərti yanacağa qənaət edilər və karbon qazının miqdarı 3,7 mln. ton azalar.

Elmi Tədqiqat Energetika İnstitutu respublikada olan meteoroloji stansiyalarda olan müşahidələrdən alınan materialları toplayıb qrup yaratmışdır. Bu qrupda olan materiallara əsasən rayonların landşaftlarına görə külək sürətinin paylanma rejimi bir neçə tiplə müəyyənləşdirilmişdir.

**A tip rejim:** Abşeron yarmadası və respublikanın şimal sərhədində Kür dilinə qədərki Xəzər sahili zonalar daxildir. Bu ərazilərdə küləyin orta illik sürəti 4 m/san-dən çox olur.

**B tip rejim:** Kür kənarı zonalar daxildir. Bu ərazilərdə küləyin orta illik sürəti 4 m/san – 3 m/san aralığında olur.

**C tip rejim:** Bu, əsasən respublikanın dağlıq rayonları üçün səciyyəvidir. Bu zonalarda küləyin orta illik sürəti 3 m/san-dən az olur. Bu zonalarda küləyin sürəti az olduğu üçün həmin zonalar külək enerjisinin istehsalı üçün yararsız hesab olunur. Burada bir nüans vardır ki, o da C zonalarına aid olan yüksək dağlıq zonalarının hələ yaxşı öyrənilməməsidir (9).

Respublikamızda olan illik külək ehtiyatının təbi şəraitinə və iqtisadi infrastrukturuna görə 800 MVt-a yaxın olduğu hesablanmışdır. Bu da ildə təxminən 2.4 milyard kVt/saat elektrik enerjisi deməkdir. Bu qədər enerji ildə 1milyon tona yaxın şərti yanacaqdan alınan enerjiyə ekvivalentdir. Eyni zamanda külli miqdarda təbii yanacaq tullantısından azad olmağa imkan verir (Yusifbayli, 2016).

Hal-hazırda Qobustan ərazisində gücü 30 MVt olan külək elektrik stansiyası fəaliyyət göstərir. Azərbaycanda bərpa olunan enerji resursları qiymətləndirilərkən ən çox külək enerji potensialının Abşeron yarmadasında olduğu müəyyənləşdirilmişdir. Uzunmüddətli təqdiqatlara əsasən, bu zonada küləyin orta sürəti 6 m/san-dən artıq olduğu müəyyənləşmişdir. Uzunmüddətli tədqiqatlar göstərir ki, Qobustan ərazisində təqdim olunmuş külək enerjisinin göstəricilərində bu potensialın yüksək olduğu üzə çıxmışdır (11).

Qobustan rayonunda 5,8 MVt gücündə hibrid tipli elektrik stansiyası tikintisinin tərkib hissəsi olan 2,7 MVt gücündə külək elektrik stansiyası layihəsinin həyata keçirilməsi əhalinin elektrik enerji təchizatını yaxşılaşdırmaqla yanaşı, "Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nda nəzərdə tutulan tədbirlərin də uğurla yerinə yetirilməsinə şərait yaradacaqdır (11).




**Şəkil 1. Respublikanın külək xəritəsi**

Uzunmüddətli aparılan tədqiqatlardan alınan nəticələrə əsasən yaradılmışdır (11).

Rayonda orta illik və orta aylıq temperaturun maksimum və mütləq minimum temperaturların paylanmasında əsas təkrar olur. Rayonun düzənlik ərazilərində mütləq maksimum temperatur 40-41ºC, dağətəyi zonada 37-40ºC, orta dağlığın aşağı zonasında 30-37ºC, 1500-2000 m yüksəklikdə 27-30ºC, yüksək dağlıqda (3000-3500 m-ə qədər) 20-30ºC-yə qədər qalxır. Bir qayda olaraq, mütləq maksimum temperatur rayonun çox hissəsində iyul ayının ikinci yarısına təsadüf olunur (Bədəlov, Kəlbiyev, 2011).

Dağlıq Şirvan iqtisadi rayonu 4 inzibati rayondan – Şamaxı, Qobustan, Ağsu və İsmayıllı inzibati rayonlarından ibarətdir. İqtisadi rayonda 4 şəhər, 4 rayon, 8 qəsəbə, 106 kənd inzibati ərazi dairəsi və 275 kənd yaşayış məntəqəsi vardır. Dağlıq Şirvan iqtisadi rayonunda 121 bələdiyyə fəaliyyət göstərir. Rayonunun ərazisi 6,06 min $km^2$-dir ki, bu da respublika ərazisinin (86,6 min $km^2$ ) 7%-ni təşkil edir. Rayon cənubdan Aran (Kür-Araz), şimal-qərbdən Şəki-Zaqatala, şimal və şimal-şərqdən Quba-Xaçmaz, şərqdən Abşeron iqtisadi coğrafi rayonları ilə həmsərhəddir.

Rayonun respublikanın digər inzibati-iqtisadi rayonlarında yerləşən əsas energetika mərkəzləri olan Mingəçevir, Bakı, Şirvan şəhərləri ilə nisbətən yaxınlıqda yerləşməsi rayona daha əlverişli şərtlərlə elektrik enerjisinin nəql edilməsinə imkan verir.

Dağlıq Şirvan iqtisadi coğrafi rayonu əlverişli iqtisadi-coğrafi mövqeyə malikdir. Havanın orta illik temperaturu bütün ərazi üçün müsbətdir. Onun ən yüksək göstəricisi 14,5ºC olmaqla rayonun düzənlik hissələrində, xüsusilə Qobustan, Şamaxı və Ağsu rayonlarının cənubunun çox hissəsində müşahidə olunur. Bu zonanın nisbi yüksəkliyi 200-300 m təşkil edir. Bu zonadan dağlıq zonaya tərəf getdikcə temperatur tədricən aşağı düşür, dağətəyi və alçaq dağlıq zonada orta illik temperatur (xüsusilə Babadağ zonasında) 0ºC qədər azalır.

## Nəticə

Dağlıq Şirvan iqtisadi zonasında inzibati rayonlar üzrə kifayət qədər torpaq sahəsinin olduğunu nəzərə alaraq külək enerjisindən istifadə üzrə avadanlıqlar tətbiq etməklə elektrik enerjisi istehsal edən sistemlər yaradıla bilər. Lakin Dağlıq Şirvan ərazisinə daxil olan bütün rayonlarda bu keçərli deyil. Sadəcə Qobustan rayonu üçün külək enerjisinin tətbiqi daha uyğundur. Müasir avadanlıqlar tətbiq etməklə elektrik enerjisi hasil edib istehlakçını təmin etmək olar.

## Ədəbiyyat

1. Yusifbayli, N., Nasibov, V. (2016). Global trends & renewable energy policy of the Azerbaijan Republic in new economic development. Caspian Oil&Gas, Conference 02-03 June, Baku.
2. https://www.desware.net/sample-chapters/d06/D10-002.pdf
3. https://bibaktim.net/yel-degirmeni-ve-ruzgar-turbini-nedir-nasil-calisir-farklari-nelerdir/
4. Məmmədov, Q.Ş. (2003). Azərbaycan Respublikasının dövlət torpaq kadastrı: hüquqi, elmi və praktiki məsələləri. Bakı: “Elm” nəşriyyatı, 448 s.
5. Bədəlov, A.B., Kəlbiyev, R.K. (2014). Azərbaycan Respublikasının günəş enerji mənbələrinin istifadəsi və kadastrı. Bakı.
6. http://www.area.gov.az, http://www.ren21.net, http://www.stat.gov.az
7. https://minenergy.gov.az/az/alternativ-ve-berpa-olunan-enerji/azerbaycanda-berpa-olunan-enerji-menbelerinden-istifade
8. https://www.encazip.com/ruzgar-enerjisi-nedir
9. https://texnoland.az/zhurzhhular/zhaerzhinlik-adzharlar/41-zhurzhhular/kulaek-elektrik-turbinlaeri.html
10. Yusifbayli, N. (2016). Renewable energy policy of the Azerbaijan Republic – Strategic Road Map. Seventh international forum on energy for sustainable development International Conference on Renewable Energy. Baku, Azerbaijan, 18-21 october.
11. https://www.esmap.org/esmap_Offshore_Wind_Roadmap_for_Azerbaijan
12. Bədəlov, A.B., Kəlbiyev, R.K. (2011). Qobustan rayonunda 2.7 MVt gücündə külək elektrik stansiyasının layihələndirilməsi, ilkin texniki iqtisadi əsaslandırılması.

**Rəyçi: t.e.n. Ramiz Kəlbiyev**

Göndərildi: 12.11.2022 Qəbul edildi: 18.01.2023

DOI: https://doi.org/10.36719/2663-4619/87/109-114

**Hüseyn Rauf oğlu Qafarov**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
huseynqafarov5@gmail.com

# BAKI ŞƏHƏRİNDƏ İCTİMAİ BİNALARDA GÜNƏŞ ENERJİSİNDƏN İSTİFADƏNİN SƏMƏRƏLİLİYİNİN ARTIRILMASI

**Xülasə**

Məqalədə Bakıda binalarda günəş enerjisindən istifadənin səmərəliliyinin artırılmasından bəhs edilir. Yaşayış binalarında insan sayı artdıqca enerjiyə olan tələbat da artır. Enerji tələbatını ödəmək üçün günəş enerjisindən istifadə etmək lazımdır. Ona görə biz, ilk öncə binada günəş enerjisindən istifadəni planlaşdıran zaman həm əməliyyat xərclərini, həm də qoyduğumuz xərcləri nəzərə almalıyıq. Günəş enerjisindən istifadənin müsbət tərəfi sağlamlıq cəhətdən təmiz olmasıdır. Nəzərə alınmalıdır ki, Bakı şəhərinin coğrafi mövqeyinə görə iqlimi günəş enerjisindən istifadə üçün ideal sayılır.

***Açar sözlər:*** *günəş batareyları, günəş enerjisi, elektrik enerjisi, enerji, batareya*

**Huseyn Rauf Gafarov**
Azerbaijan State Oil and Industry University
master student
huseyngafarov5@gmail.com

## Increasing the efficiency of using solar energy in public buildings in Baku

**Abstract**

In our article, we will look at increasing the efficiency of using solar energy in buildings in Baku. As the number of people in residential buildings increases, the demand for energy increases, and it is necessary to use solar energy to meet the energy demand. Therefore, we must first consider both operating costs and investment costs when planning the use of olar energy in a building. The positive side of using solar energy is that it is healthy. It should be taken into account that due to the geographical location of Baku, the climate is ideal for using solar energy.

***Keywords:*** *solar cells, solar energy, electricity, energy, battery*

## Giriş

Günəşin gücü ənənəvi ehtiyat olan daş kömür, neft, təbii qaz və s. yanacaqlardan qat-qat güclü və çoxdur. Günəşin gücünün 0,0125%-ni istifadə edə bilsək, çoxlu enerji ehtiyatını ödəyə bilərik. Günəş enerjisinin müsbət cəhəti odur ki, qurğular istifadə olunduqda istixana effekti yaranmır, havaya zərərli maddələr yayılmır, aşağı atmosfer qatında istilik əmələ gəlmir. Bu enerjinin mənfi cəhəti yalnız odur ki, havanın necə olmasından və fəsildən asılıdır. Günəşdən alınan enerji iki növdə istifadə oluna bilər:

1) istilik enerjisi şəklində;
2) elektrik enerjisi şəklində.

Günəşdən alınan enerjini elektirik enerjisi kimi istifadə etmək üçün fərqli kollektorlardan istifadə olunur. Günəş şüalarını toplayan, əks etdirən, günəş istiqamətinə doğru yönələn günəş kollektorlarını misal çəkə bilərik. Günəşdən aldığımız enerjinin daha da faydalı olması üçün fotoelemendə günəş enerjisinin elektrik enerjisinə çevrilməsi həyata keçirilir. Fotoelement işığa həssas olduğundan, əsasən selen, silisium, qallium arsendi və digər materiallardan hazırlana bilər. Buradan elektrik enerjisinin alınması p-n keçidi vasitəsi ilə, yəni işığın udulması hesabına baş verir. Aparılan araşdırmalar göstərir ki, günəş qurğularını, əsasən cənub istiqamətində yerləşən zonalarda

quraşdırmaq təxminən 50-ci enlilikdə daha məqsədə uyğun sayılır. Nəzərə almalıyıq ki, Azərbaycanda 300 günəşli gün olur, bu da günəş enerjisindən istifadənin əlverişli olduğunu göstərir (1).

**İşıqlandırma üçün günəş enerjisinin istifadə edilməsi**

Hal-hazırda dünyada ekoloji təmizlik cəhətdən binalarda bərpa olunan enerji mənbələrindən geniş şəkildə istifadə olunur. Bunun üçün bina fasadlarının və binanın ərazisinin işıqlandırma sisteminin lahiyə olunması vacib sayılır. İşıqlandırma üçün fotoelektrik modula əsaslanan günəş çıraqları istifadə etmək olar. Bundan əlavə, işıqlandırmada komplekt şəkildə fotoelektrik fənərlər və gecənin qaranlıq vaxtında işığı avtomatik şəkildə yandırıb-söndürən xüsusi kontrollerləri olan taymerlər quraşdırılmalıdır (2, 2012: 6).

**Etibarlı və səmərəli günəş işıqlandırılma sxemi**

Binada günəş enerjisi vasitəsi ilə elektrik enerjisi istehsal etmək üçün ilkin olaraq şəbəkədə günəş batareyalarını fotoelektrik inventorlarla kombinə şəklində istifadə edə bilərik.

Sistemin işini qiymətləndirmək üçün günəş batareyasından alınan enerjinin gündüz və ya gecə vaxtında alınması böyük əhəmiyyət kəsb etmir. Bununla da aşağıdakı üstünlükləri əldə edirik:

- Akkumulyator lazım olmur. Akkumulyator bahalı sərfiyyat materialıdır; gün ərzində dolub boşaldıqca 3 ildən bir dəyişməlidr.
- Günəşdən alınan enerjini lazımı vaxtda istifadə edə bilərik.
- İşıqlandırma davamlı olaraq işlək vəziyyətdə olur, hava buludlu və ya panelin üzəri qarla örtülsə belə. Lakin bu zaman enerji qənaəti aşağı olacaq.
- Batareyanın gücünün dəfələrlə azalması mümkündür. Tutqun havaya qarşı tədbir görməyə və akkumulyatorun dolub boşalmasına ehtiyac qalmır.
- Günəş batareyaları işıq lampalarına lazım olandan az elektrik enerjisi istehsal edir. Ümumilikdə işıqlandırıcı qurğu və günəş batareyasının gücü bir-birinə bağlı olmur. Şəbəkədə ola biləcək hər hansı qəza zamanı lampanın işinin təmin edilməsi lazım olduqda akkumulyatorla bir yerdə kiçik nizamlayıcı, başqa sözlə fasiləsiz işi təmin edən qurğu quraşdırılmalıdır.
- Binanın elektrik şəbəkəsində heç bir dəyişiklik etmək lazım gəlmir, çünki günəş elektrik qüvvəsi ilə təchizolunma sistemi binanın hər yerində quraşdırılır.
- Şəbəkə inventorunun faydalı iş əmsalı daha yüksəkdir, nəinki yük kontrolleri-akkumulyator-invertor.
- Günəş enerjisinin tarifinin çox olduğu saat, əsasən gündüz vaxtı sayılır, çünki gündüz daha çox enerji istehsal edilir, lampalar isə gecə vaxtı olduğuna görə ucuz tariflə qidalanır (2, 2012: 7, 8, 9).

**Fotovoltaik sistemlər**

Fotovoltaik (PV) sistemləri, günəş batareyalarının köməyi ilə günəş şüalarından elektrik enerjisi istehsal edərək, bu enerjidən istifadəyə şərait yaradan bütün komponentlər məcmusu başa düşülür. PV sistemləri, əsasən sadə və yaxud fərqli yolların işıqlandırılmasında, mayak evləri, binalar da elektrik enerji istehsalında istifadə olunur. Bildiyimiz kimi, fotovoltaik sistem elektrik enerjisi istehsal edən zaman onu ehtiyac olduqda saxlamaq və ya istifadə olunan sahələrə düzgün şəkildə ötürməyə xidmət edir. Fotovolatik batareyalar, əsasən binaların fasadlarına, damlarında yerləşdirilir və buradan səthlərə gələn günəş şüalarını, yəni günəş enerjisini elektrik enerjisinə çevirir.

Daxili məqsədlər üçün istifadə olunan günəş selləri elektrik şəbəkəsinə birbaşa olaraq invertor köməyi ilə qoşulur və bununla istehsal edilən elektrik enerjisinin xeyli hissəsinin batareyada qalmasına nail oluruq (3).

**Fotoelektrik enerji sistemlərinin növləri**

Müstəqil fotoelektrik sistemi mərkəzləşdirilmiş elektrik qüvvəsi ilə təchizetmə şəbəkələrindən heç asılı deyil. Günəş batareyalarının enerjisi birbaşa istehlakçılar tərəfindən istifadə edildiyi bəzi xüsusi hallar istisna olmaqla (məsələn, suvuran qurğular, günəş ventilyasiyası və s.), bütün müstəqil sistemlərin tərkibində akkumulyator batareyaları olmalıdır. Akkumulyatorlardan alınan enerji günəş radiasiyası kifayət qədər gəlməyəndə və ya yüklər günəş batareyalarının generasiyasından çox olanda istifadə edilir (4).

Şəbəkə ilə birləşdirilmiş batareya fotoeletkrik sistemi müstəqil sistemə oxşayır. Burada da akkumulyator batareyaları istifadə edilir, lakin belə sistem, eyni zamanda mərkəzləşdirilmiş elektrik qüvvəsi ilə təchizetmə şəbəkələrinə qoşulur. Buna görə günəş batareyaları generasiya etdiyi artıq enerji yükə və ya sistemə yönəldilə bilər (bunun üçün xüsusi invertorlar tələb olunur; həmin invertorlar şəbəkə ilə paralel işləyə bilir və onları bəzən "hibrid" adlandırırlar). İstehlak günəş batareyaları generasiya etdiyi enerjidən artıqdırsa, çatışmayan enerji şəbəkədən götürülür. Doldurucu qurğusu olan belə invertorların bəzi modellərində akkumulyator doldurulması üçün üstünlük daimi cərəyan mənbəyindən (məsələn, günəş kontrollerindən) doldurmaya verilir. Bununla şəbəkədən akkumulyatorların doldurulmasına istifadə edilən enerji azaldılır (5).

Şəbəkə ilə bağlı elə batareya sistemləri var ki, onlarda günəş batareyalarının doldurma kontrollerləri əvəzinə, akumulyator batareyasının çıxışına birləşdirilmiş şəbəkə fotoelektrik invertorları istifadə edilir. Belə imkan yalnız bir neçə akumulyator batareyalarının modelində var, lakin sistemin ümumi effektivliyi şəbəkə fotoelektrik invertorların istifadəsi hesabına AB doldurma kontrollerlərindən daha yüksək ola bilər (2, 2012: 9).

**Binada texniki sahənin və lift zonasının günəş batareyası vasitəsi ilə işıqlandırılması sisteminin üstünlüyü:**

- əhalinin və personalın rahatlığı;
- elektrik enerjisinə görə ödənişin olmaması;
- elektrik enerjisinin daimi olması;
- qənaətcil olması;
- istismarı 25 il;
- ekoloji cəhətdən təmiz olması.

**Binada günəş enerjisi sərfinin hesablanması**

Əlbəttə, enerji səmərəliliyinin müasir, innovasiya metodları mövcuddur. Məsələn, binanın damında günəş batareyalarının quraşdırılması. 6 girişli 9 mərtəbəli standart binanın işıqlandırılmasına ildə təxminən 15000 AZN sərf olunur. Müasir çoxmərtəbəli yaşayış komplekslərinin işıqlandırılmasına isə bundan da çox məbləğ. Həqiqətən, meydançalarda, xollarda və nərdivanlarda çox vaxt işıq boş yerə yanır, adamlar həmişə orada olmur, mənzildən liftə getmək və ya zibili zibil borusuna atmaq üçün cəmi iki dəqiqə vaxt lazımdır (6).

Biz israfçılığa qarşı çox sadə və səmərəli mübarizə metodu təklif edirik. Standart çıraqları qənaətli, optik-akustik və ya infraqırmızı sensorlarla əvəz etmək və ya sadəcə sensorları mövcud çıraqlara qoşmaq. İldə təxminən 90% elektrik enerjisinə qənaət etmək olar. Axı işıq indi yalnız evdə adam olanda və yalnız təbii işıqlıq dərəcəsi kifayət etməyən halda yandırılacaq. Belə qənaətə işıq mənbəyi kimi adi közərmə lampalarını saxlamaqla nail olmaq olar. Müasir yığcam lüminessent və ya LED lampaları ilə daha çox, 99% qənaət etmək olar! Nəzərə alsaq ki, avadanlığın dəyəri bir o qədər də yüksək deyil, montajı isə sadə işıqlandırmanın yeniləşdirilməsinə edilən xərclər çox tez çıxır (1.5-2 ay) (7, 8).

Bu günə, işığın avtomatik idarə edilməsi üçün üç tip sensor mövuddur: optik, akustik və infraqırmızı.

*Optik sensor* işıqlanma dərəcəsini qiymətləndirir və o, tapşırılmış səviyyədən yuxarı və ya aşağı olanda işığı, müvafiq olaraq yandırır və ya söndürür (9, 10).

*Akustik sensor* səs-küy olanda, məsələn, addımların, açılan qapının, açarların cingiltisi və s. səsi gələndə işığı yandırır. Səs-küy kəsiləndə işıq müəyyən vaxt keçəndən sonra söndürülür.

*İnfraqırmızı sensor* öz iş zonasında adamın görünməsinə reaksiya verir və işığı yandırır. Adam sensorun iş zonasından çıxandan müəyyən vaxt sonra işıq söndürülür (Bədəlov, Kəlbiyev, 2011).

Standart çıraqların qənaətli çıraqlarla əvəz edilməsinin iqtisadi effektini konkret bir evin misalında hesablayaq.

Beləliklə, üzərində təcrübə aparılan ev 9 mərtəbəli, 6 girişli standart yaşayış evidir. Belə evdə təxminən 400 ədəd 60 Vt-luq közərmə lampası quraşdırılır. Gəlin, hesablayaq, bu kimi çıraqlarla xolların və nərdivanların işıqlandırılması bu evin sakinlərinə neçəyə başa gəlir:

**400 ədəd x 0,06 kVt x 24 saat x 365 gün x 0.06 AZN = ildə 12 614 AZN**

İndi baxaq, çıraqları qənaətli lampalarla əvəz etsək, nə dəyişəcək. Məsələn, bizim kommunal təsərrüfat işçiləri arasında məşhur olan, Türkiyədə istehsal edilən optik akustik CA-18 çıraqları.

CA 18-in quraşdırılmış optik-akustik sensoru var. Müvafiq olaraq, işıq 24 saat deyil, yalnız zəruri olduğu halda yanacaq, yəni evdə adam olanda və yalnız təbii işıqlıq dərəcəsi kifayət etmədiyi halda (Məmmədov, 2003: 448).

**Cədvəl.**
**9-mərtəbəli binanın işıqlandırılması modeli:**
**Hərəkət detektoru olan çıraqların sayı**

| | | | |
|---|---|---|---|
| Hər küçə qapısı | 17 | 26 | 35 |
| Hər mərtəbə | 1 | 2 | 3 |
| Hər pilləkən | 1 | 1 | 1 |
| Batareya sayı | 3 | 5 | 6 |
| Qiymət (Avro) | 5200 | 7800 | 8500 |

Qarantiya xidməti – 2 il
Xarakteristikalar
İşıqlandırmanın hərəkət detektorundan avtomatik qoşulması
Qoşulmadan bir dəqiqə sonra işıqlandırılmanın kəsilməsi
Gecə-gündüzlü iş
Çıraq, tipi LED
İşıq axını közərmə lampasının analoqu, 100 Vt
İşıqlanmanın rəngi soyuq, ağ (Yusifbayli, Nasibov, 2016)

## Nəticə

İstifadə edilən enerji barədə məlumatları və lampanın sutkada 6 saat işlədiyini nəzərə alaraq, sayğaca görə seçdiyimiz lampaların illik sərfinin neçə kVt olmasını hesablaya bilərik. Hazırda, Azərbaycanda kVt elektrik enerjisinin dəyəri 0.06 AZN-dir. Hesablamalarımda bu məlumatı istifadə edirəm: nəzərə alsaq ki, 75 Vt lampa gündüz 6 saat ərzində istifadə edilir:

1. Közərmə lampası: 0,45 kVt x 365 gün = 164,2 kVt x 0.06 AZN = 9.8 AZN + 2.2 AZN = 12 AZN 1 ildə.
2. Qənaətli lampa: 0,09 kVt x 365 gün = 32,85 kVt x 365 gün = 2 AZN + 0.6 AZN = 2.6 AZN 1 ildə.

| **Lampa** | **İstifadə edilən elektrik enerjisi (Vt)** | **İstismar müddəti (saat) Qiymət (AZN)** | **Lampa** |
|---|---|---|---|
| Közərmə | 75 Vt | 1000 | 1 |
| Qənaət edən | 15 Vt | 10000 | 3 |

Gördüyünüz kimi, burada yalnız bir lampanın istifadəsinə dair hesablamalar verilmişdir. Sadə arifmetik hesablama ilə mənzildəki lampaların sayını hesablayıb və yuxarıda göstərilən məbləği lampaların sayına vurmaq olar (2, 2012: 11).




Günəş batareyaları (1);
Akkumulyatorlar (2);
Akkumulyator yükləmə kontrolleri, invertor (3);
Çıraqlar və hərəkət detektorları (4);
Məftillər, kommutasiya qurğuları, elektrik şkaf (5);
Montaj elementləri (6) (2, 2012: 13, 14, 15).

| Qurğu | İstismar müddəti (il) | İstehsalçı |
|---|---|---|
| Fotoelement | 25 | Ukrayna |
| Çıraq | 13 | Ukrayna |
| Akkumulyator | 10 | Almaniya |
| Yük kontrolleri | 15 | ABŞ |

**Ədəbiyyat**

1. https://www.texnoland.az/faydal-maelumatlar/zhunaesh-panellaeri.html
2. İlkin texniki-iqtisadi əsaslandırma. (2012). Alten Group. Bakı.
3. https://www.intechopen.com/chapters/73187
4. https://www.intechopen.com/chapters/73729
5. https://www.researchgate.net/publication/335321716_Solar_energy_energy_conservation_In_buildings
6. https://www.asla.org/residentialsolar.aspx
7. http://solarbyempire.com/why-solar/solar-panel-efficiency

8. https://azescience.org/gb/azerbaycanda-gunes-enerjisinden-istifade/
9. https://minenergy.gov.az/az/alternativ-ve-berpa-olunan-enerji/azerbaycanda-berpa-olunan-enerji-menbelerinden-istifade
10. http://solarbyempire.com/why-solar/solar-panel-efficiency
11. Bədəlov, A.B., Kəlbiyev, R.K. (2011). Qobustan rayonunda 2.7 MVt gücündə külək elektrik stansiyasının layihələndirilməsi, ilkin texniki iqtisadi əsaslandırılmnası.
12. Məmmədov, Q.Ş. (2003). Azərbaycan Respublikasının dövlət torpaq kadastrı: hüquqi, elmi və praktiki məsələləri. Bakı: "Elm" nəşriyyatı, 448 s.
13. Yusifbayli, N., Nasibov, V. (2016). Global trends & renewable energy policy of the Azerbaijan Republic in new economic development. Caspian Oil&Gas, Conference 02-03 june, Baku.

**Rəyçi: t.e.n. Ramiz Kəlbiyev**

Göndərildi: 30.10.2022 Qəbul edildi: 20.01.2023

# İÇİNDƏKİLƏR

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES



## TƏBİƏT ELMLƏRİ

## NATURAL SCIENCES

## TEXNİKA ELMLƏRİ

## TECHNICAL SCIENCES



İmzalandı: 17.02.2023
Kağız formatı: 60x84 1/8
H/n həcmi: 14.5 ç.v.
Sifariş: 618

---

"ZƏNGƏZURDA" çap evində çap olunub.
**Ünvan:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.,
"Azərbaycan" nəşriyyatı, 6-cı mərtəbə.
Tel.: + 994 50 209 59 68
+ 994 55 209 59 68
+ 994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru

